"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

HEYDƏR ƏLİYEV 100

## BİZ MÜHARİBƏNİN NƏ OLDUĞUNU BİLİRİK.



**Onun xalqlar üçün nə dərəcədə dağıntılar və əziyyətlər gətirdiyini bilirik.** Ona görə də, Avrasiyada sülhün bərqərar olmasını istəyirik.

- **Hazırda biz Ermənistan ilə Azərbaycan arasında sülh sazişi üzərində çalışırıq.** Ümid edirik ki, biz bu işi gec yox, tezliklə tamamlayacağıq.
- Bu, ciddi tarixi fikir ayrılığına malik olan ölkələrin bir araya gəlməsi və düşmənçilik səhifəsinin bağlanmasında yaxşı nümunə ola bilər.

*Münxen Təhlükəsizlik Konfransı*
*Almaniya, Münxen, 18 fevral 2023-cü il*

İLHAM ƏLİYEV
AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ




*Qardaş Türkiyənin bir sıra vilayətlərində baş vermiş dəhşətli zəlzələlər nəticəsində çoxsaylı insan tələfatından kədərləndiyimizi bildirir, dünyasını dəyişənlərin yaxınlarına və bütün Türkiyə xalqına dərin hüznlə başsağlığı verir, yaralılara Allahdan şəfa diləyirik!*

*Ümid edirik ki, zəlzələnin fəsadları tezliklə aradan qaldırılacaq.*

*Başın sağ olsun, Türkiyə!*



*1921-ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Yanvar-Fevral, 2023 / № 1 (1119)

## ADPU REKTORU QIŞ İMTAHAN SESSİYASININ GEDİŞİ İLƏ TANIŞ OLUB

Yanvar ayının 5-dən etibarən Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2022-2023-cü tədris ilinin qış imtahan sessiyasına start verilib. İmtahan prosesi yazılı, şifahi və hibrid formada təşkil olunur.

Yanvarın 6-da ADPU-nun rektoru professor Cəfər Cəfərov universitetdə qış imtahan sessiyasının gedişini izləyib. Rektor yazılı və şifahi imtahanların gedişini yerində izlədikdən sonra imtahan prosesini tənzimləmək və yarana biləcək problemlərin operativ həll olunması üçün fəaliyyət göstərən İmtahan Qərargahı və Apelyasiya Komissiyasının işi və imtahan nəticələrinin yoxlanılması prosesi ilə tanış olub.

Qeyd edək ki, imtahan prosesinin təşkilində şəffaflığın və təhsilalanların iştirakının təmin edilməsi məqsədi ilə sessiya ərzində İctimai Şura üzvləri və tələbə təşkilatlarının nümayəndələri prosesi müşahidə edirlər.

Qeyd edək ki, 09-12 yanvar tarixlərində ölkə ərazisində və paytaxt Bakı şəhərində müşahidə olunan qarlı hava şəraiti ilə bağlı imtahanların təşkilində hər hansı problem yaranmayıb.



Bununla belə, Pedaqoji Universitetdə kəskin hava şəraiti ilə bağlı yaranan problemləri nəzərə alaraq, imtahanlarda iştirak edə bilməyən və ya imtahana gecikən tələbələr üzürlü hesab olunub və onlara əlavə vaxt təyin edilərək iştirak edə bilmədikləri və ya gecikdikləri imtahanlara yenidən qatılma imkanı yaradılıb.

## PEDAQOJİ UNİVERSİTETDƏ 20 YANVAR FACİƏSİNİN 33-CÜ İLDÖNÜMÜ QEYD OLUNUB

Yanvarın 17-də ADPU-da Yeni Azərbaycan Partiyasının (YAP) "Ü.Hacıbəyli-68" Ərazi Partiya Təşkilatının (ƏPT) təşkilatçılığı ilə 20 Yanvar faciəsinin 33-cü ildönümünə həsr olunmuş görüş keçirilib. Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib və vətənimizin azdlığı uğrunda canlarından keçmiş şəhidlərin əziz xatirələri bir dəqiqəlik sükutla yad edilib.

Çıxış edən rektor professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, bundan 33 il öncə müstəqil dövlətçilik tariximizin acılı, lakin şərəfli günləri yaşanıb. Rektor vurğulayıb ki, xalqımızın Ümummilli Lideri Heydər Əliyev tərəfindən bu hadisələrə ilk dəfə hüquqi-siyasi qiymət verildi və bu gün 20 Yanvar şəhidlərinin xatirəsi hər birimizin qəlbində əbədi yaşayır.

20 Yanvar hadisələrinə aid videoçarxın nümayişindən sonra istedadlı gənc şair, 20 yaşlı 20 Yanvar şəhidi Ülvi Bünyadzadənin bibisi professor Almaz Ülvi, 20 Yanvar şəhidlərindən AMEA-nın aspirantı, ADNSU-nun müəllimi Yusif Sadıqovun bacısı professor Sayalı Sadıqova və Fəridə Allahverdiyevanın qardaşı Zakir Nəbiyev təəssüratlarını bölüşərək, bu misilsiz faciədə xalqımızın onlarla igid övladlarının vətənin gələcəyi üçün özlərini qurban verdikləri qeyd ediblər.

Universitetin Filologiya fakültəsinin II tədris ili tələbəsi Aytac Muradlının ifasında tanınmış şairə Mahirə Nağıqızının "Şəhidlər"



şeirinin səsləndirilməsindən sonra tədbir iştirakçılarından ADPU-nun prorektoru professor Asəf Zamanov, professor Hacan Hacıyev, AMEA-nın müxbir üzvü Novruz Quliyev və YAP veteranı Rizvan Vahabov da fikirlərini bölüşərək Azərbaycan tarixində önəmli mərhələ təşkil edən bu cür qanla yazılan tarixlərin qeyd olunması və yaşadılmasının əhəmiyyətini vurğulayıblar.

Sonda "Ü.Hacıbəyli-68" ƏPT-nin sədri dosent Sultanəli Qurbanov yekun nitqi ilə çıxış edərək şəhidlərimizin xatirəsini yaşatmağın hər birimiz üçün vacib missiya olduğunu qeyd edib.

## ADPU-DA PROFESSOR-MÜƏLLİM HEYƏTİNİN REYTİNQ QİYMƏTLƏNDİRİLMƏSİ İLƏ BAĞLI İCLAS KEÇİRİLİB



Yanvarın 18-də Universitetdə (ADPU) 2022-ci il üzrə professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi ilə bağlı Keyfiyyət Komissiyasının iclası keçirilib.

Giriş nitqi ilə çıxış edən rektor professor Cəfər Cəfərov bildirib ki, Pedaqoji Universitetdə akademik heyətin elmi-pedaqoji fəaliyyətinin stimullaşdırılması və diferensial sosial təminat sistemini inkişaf etdirmək məqsədi ilə artıq beş ildir ki, müntəzəm olaraq professor-müəllim heyətinin illik reytinq qiymətləndirilməsi keçirilir. Rektor vurğulayıb ki, qiymətləndirmə nəticəsində elmi-tədqiqat, pedaqoji və ictimai fəaliyyətində fərqlənən müəllimlərin əməkhaqlarına aylıq əlavələr tətbiq olunur.

Çıxış edən tədris işləri üzrə prorektor dosent Eldar Aslanov diqqətə çatdırıb ki, ötən il reytinq qiymətləndirilməsi ilə bağlı Keyfiyyətin təminatı şöbəsi tərəfindən təkcə ADPU-nun deyil, filiallar və Pedaqoji Kollecin də professor-müəllim heyətinin sənədləri qəbul olunub və proses könüllü əsaslarla bütün ADPU şəbəkəsini əhatə edib. Daha sonra Keyfiyyətin təminatı şöbəsinin müdiri dosent Qalib Şərifov təqdimatla çıxış edərək 2022-ci il üzrə reytinq qiymətləndirilməsi prosesi haqqında məlumat verib. Şöbə müdiri bildirib ki, ötən ilin noyabrın 1-dən dekabrın 1-nə qədər əsas iş yeri ADPU, onun filialları və kolleci olan 1206 müəllimdən müvafiq sənədlər qəbul olunub. Sənədlər Keyfiyyət Komissiyası tərəfindən qiymətləndirilərək meyarlar üzrə ballar hesablanıb. Prosesin, əsasən, tamamlandığını qeyd edən Q.Şərifov nəticələrlə bağlı ümumilikdə 75 apelyasiya müraciətinin daxil olduğunu, onlardan da 35 məsələnin spesifikliyi nəzərə alınaraq bugünkü iclasda Komissiya tərəfindən müzakirə olunacağını diqqətə çatdırıb.

İclasın yekununda ADPU-da professor-müəllim heyətinin reytinq qiymətləndirilməsi meyarlarının təkmilləşdirilməsi və gələcəkdə tədris-köməkçi heyət arasında da reytinq qiymətləndirilməsinin aparılması ilə bağlı müvafiq təkliflərin hazırlanması haqqında qərar qəbul olunub.

### PROREKTOR ELDAR ASLANOV: "ÖLKƏMİZƏ XİDMƏT BİZİM MİLLİ BORCUMUZDUR."




Türkiyədə təhsil alaraq dünyanın müxtəlif ölkələrində karyeralarını davam etdirən "Türkiyə Məzunları" İstanbulda "Türkiyə Məzunları Forumu - 2023"-də bir araya gəliblər. Türkiyə Respublikasının Prezidenti Rəcəb Tayyib Ərdoğanın himayəsi, Xaricdə Yaşayan Türklər və Qohum Cəmiyyətlər Baş İdarəsinin təşkilatçılığı ilə keçirilən foruma 60 ölkədən ali təhsilini Türkiyədə başa vurmuş 200 məzun qatılıb. Forum çərçivəsində Türkiyə Respublikası mədəniyyət və turizm naziri Mehmet Nuri Ersoyun və bir çox rəsmilər, alim və məzunların iştirakı ilə panellər keçirilib. Panellərdə çıxış edən məzunlar aldıqları təhsillə ölkələrinə qayıtdıqdan sonra əldə etdikləri nailiyyətlərdən danışıblar. Qeyd edək ki, forumda iştirak edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov da magistratura və doktorantura təhsilini Türkiyədə alıb. Türkiyə mediasında açıqlamasında "Azərbaycanlı tələbələrin qardaş ölkə olan Türkiyədə təhsil alması xüsusi bir fərqlilikdir" deyən E.Aslanov bildirib: "Biz burada təhsil almaqdan qürur duyuruq. Burada olduğum müddətdə müxtəlif ölkələrdən dostlar qazandım. Hamımız uğur qazanmışıq. Bu, Türkiyənin təhsil sisteminin çox uğurlu olduğunun göstəricisidir. Türkiyədə doktorantura təhsilimi bitirdikdən sonra çox cəlbedici bir iş təklifi aldım. Amma mən öz ölkəmə getmək istəyirdim. Ölkəmizə xidmət bizim milli borcumuzdur."

### BEYNƏLXALQ ASTRONAVTİKA KONQRESİ İLƏ BAĞLI MƏLUMATLANDIRICI GÖRÜŞ KEÇİRİLİB



Bakıda keçiriləcək 74-cü Beynəlxalq Astronavtika Konqresi ilə bağlı ADPU-nun SABAH qruplarının tələbələrinin Azərbaycan Respublikasının Kosmik Agentliyinin (Azərkosmos) təhsil və tanıtım üzrə meneceri İmran Muxtarovla görüşü keçirilib. Görüşdə Yerin müşahidəsi, rabitə, naviqasiya, insanın kosmosa uçuşu və kiçik peyklər, hazırkı və gələcək əməliyyat tətbiqləri, təhsil, siyasət, iqtisadiyyat, tarix və hüquq da daxil olmaqla kosmosun cəmiyyətlə qarşılıqlı əlaqəsi haqqında tələbələrə məlumat verilmişdir. Sonda müsabiqədə iştirak etmək şərtləri, elm və tədqiqat, tətbiqlər və əməliyyatlar, texnologiya, infrastruktur, kosmos və cəmiyyət mövzularında məqalələrin yazılma qaydaları haqqında izahat verilmiş və tələbələrin sualları cavablandırılmışdır.




ADPU-nun Kitabxana-İnformasiya Mərkəzi ölkəmizin ən böyük universitet kitabxanalarından biridir. Kitabxananın ümumi fondu 746.221 nüsxə ədəbiyyat təşkil edir ki, bunlardan 670.640 nüsxəsi kitablardır. Ən müasir standartlara uyğun qurulmuş elektron kitabxana xidməti də tələbələrin ixtiyarındadır. Hazırda ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinin e-kataloqunda 12.818 adda 81.746 nüsxə kitab mövcuddur. Kitabxana tələbələrin tədris həyatında önəmli rol oynayır. Belə ki, başa vurduğumuz 2022-ci il ərzində kitabxanadan 9.646 nəfər oxucu istifadə edib. Onların arasında 105 nəfər kənar oxuculardır. İl ərzində 22.146 nüsxə kitab, 416 nüsxə dövri-elmi nəşrlərin oxuculara verilişi həyata keçirilib. Ötən il ərzində 10.770 nəfər elektron kitabxanadan yararlanıb. Kitabxanaya daxil olmuş 7.382 sorğu müvafiq qaydada cavablandırılmışdır. Kitabxana fondunun daimi yenilənməsi də diqqət mərkəzindədir. 2022-ci ildə ADPU kitabxanasına 829 adda 3472 nüsxə yeni kitab, 18 elmlər doktorluğu və fəlsəfə doktorluğu dissertasiyası, 108 avtoreferat, 621 proqram, 22 adda 63 nüsxə dövri-elmi nəşrlər və jurnallar daxil olmuşdur. Pedaqoji Universitet kitabxanası oxuculara xidmət etməklə yanaşı, mədəni-kütləvi tədbirlərin təşkili və təbliğat, kitab mütaliəsinin populyarlaşdırılmasına da xüsusi diqqət ayırır. Azərbaycan Respublikasında 2022-ci ilin "Şuşa ili" elan edilməsi haqqında Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 5 yanvar 2022-ci il tarixli Sərəncamına uyğun olaraq ADPU Kitabxana-İnformasiya Mərkəzində Şuşa şəhərinin tarixi ilə bağlı nəşr olunmuş kitabların sərgisi təşkil olunmuşdur. Kitabxanaya xaricdən alınmış 74 adda 77 nüsxə təhsil tədqiqatlarına dair kitabların sərgisi də elmi-pedaqoji heyətin böyük marağına səbəb olmuşdur. Kitab almağı təşviq etmək məqsədi ilə təşkil edilən kitab-satış yarmarkası da bu tədbirlər sırasında xüsusilə qeyd olunmalıdır. Kitabxana 5-9 oktyabr 2022-ci il tarixində Bakı Ekspo Mərkəzində keçirilən 8-ci Bakı Beynəlxalq Kitab Sərgi-Yarmarkasında iştirak edib.

## LİSEYLƏRDƏ FİZİKA TƏLİMİNƏ YENİ YANAŞMA

Məlumdur ki, ölkəmizdə ali təhsil müəssisələrində bir sıra təkmilləşdirmə işləri aparılır. Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) də bu təkmilləşdirmə prosesinin önündə inamla addımlayır. Bu universitetin seminarlarında Azərbaycan təhsil məkanında müəllim hazırlığı sahəsində bir sıra yeni innovativ yanaşmalar irəli sürülür və müzakirələr aparılır. Bu qəbildən olan növbəti seminar 24 yanvar 2023-ci il tarixində ADPU-nun Fizika fakültəsində keçirilmişdir. Belə ki, bu seminarda fakültənin "Fizikanın tədrisi texnologiyası" kafedrasının dosenti Qalib Şərifov "Liseylərdə fizika təlimi konsepsiyası və qiymətləndirmə modelləri" adlı mövzu üzrə məruzə ilə çıxış etmişdir. Seminarı giriş sözü ilə açan Fizika fakültəsinin dekanı dos. Arzu Daşdəmirov seminar mövzunun aktuallığını iştirakçıların diqqətinə çatdırdı və bu tip silsilə seminarların fakültədə keçirilməsinin əhəmiyyətini vurğuladı. Sonra Qalib Şərifov mövzuya dair geniş təqdimatla çıxış etdi. O, Avropada və İngiltərədə Blum taksonomiyaları əsasında hazırlanan yeni qiymətləndirmə modeli vasitəsilə şagirdlərin bilik və bacarıqlarının yoxlanılması, qiymətləndirmə modelinin mövcud kurikulum standartları ilə müqayisəli təhlili haqqında ətraflı məlumat verdi. Məruzəçi liseylərdə iş təcrübəsindən qaynaqlanan və tədqiqat mövzusu ilə əlaqədar apardığı pedaqoji təcrübələrdə rast gəldiyi bəzi problemlərdən danışdı. Bununla yanaşı o, liseylərdə fizika təliminin təkmilləşdirilməsinin vacibliyini vurğuladı. Daha sonra o, təqdimatında bu təhsil müəssisələri üçün hazırladığı beş komponentli konsepsiyanın hər bir komponenti haqqında məlumat verdi. Daha sonra "Qiymətləndirmə-monitorinq" komponentinə daxil olan elementləri ətraflı şərh etdi. O, Amerikada, İngiltərədə və dünyanın 160-dan çox ölkəsində istifadə olunan IB, IGCSE və AP Fizika üzrə qiymətləndirmə modellərinin və onlarda şagirdlərin bilik və fəaliyyətinin ölçülə bilməsinin xüsusiliyindən danışdı. Qalib Şərifov bu qiymətləndimə modelləri əsasında lisey şagirdlərinin fizika biliyinin qiymətləndirmək üçün özünün tərtib etdiyi standartlar paketini, perspektiv planları, rubrikləri təqdim etdi. Bunda başqa o, qeyd etdi ki, bu standartlar paketi Blum taksanomiyasının bütün mərhələlərinə uyğun bilik və bacarıqları dəqiq ölçməyə imkan verir.



Seminarda İbtidai təhsilin pedaqogikası kafedrasının müdiri professor Fərrux Rüstəmov, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri professor Müseyib İlyasov, Kompüter elmləri kafedrasının professoru Əbülfət Pələngov, professor Vilayət İsmayılov, professor Naxçıvan Səfərov, professor Vidadi Orucov, Fizikanın tədrisi texnologiyasının müdiri dos. Sevinc Cəlilova, Ümumi fizika kafedrasının müdiri prof. Cahangir Hüseynov və fakültənin professor-müəllim heyəti iştirak etmişdir.

## MÜƏLLİM VƏ TƏLƏBƏLƏRƏ IELTS SERTİFİKATLARI TƏQDİM OLUNUB



Yanvarın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Təhsildə Keyfiyyət Təminatı Agentliyi (TKTA), Təhsilin İnkişafı Fondu (TİF) və Britaniya Şurası ilə (British Council, BŞ) tərəfdaşlıq əsasında təşkil olunan IELTS imtahanlarında iştirak edən universitetin bir qrup müəllim və tələbələrinə sertifikatların təqdim olunması mərasimi keçirilib. Mərasimdə ADPU rəhbərliyi, müvafiq qurumların əməkdaşları, universitetin Filologiya fakültəsinin müvafiq struktur rəhbərləri və namizəd müəllim və tələbələr iştirak ediblər. Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov deyib: "Pedaqoji Universitetlə Təhsildə Keyfiyyət Təminatı Agentliyi və Təhsilin İnkişafı Fondu arasında imzalanmış əməkdaşlıq müqaviləsi əsasında insan kapitalının formalaşdırılmasının gücləndirilməsi və istedadlı tələbələrin ingilis dilini mənimsəməsi məqsədilə universitetimizin bir qrup müəllim və tələbəsi üçün IELTS imtahanı təşkil edilmişdır. Britaniya Şurasının təşkilatçılığı ilə keçirilən imtahanda universitetdaxili müsabiqə əsasında seçilmiş 9 müəllim və 10 tələbə iştirak etmiş və hər biri yüksək nəticə ilə beynəlxalq dil sertifikatı qazanmışdır. Cari il ərzində daha artıq tələbənin imtahanlara cəlb olunması nəzərdə tutulur."

Çıxış edənlərdə Təhsildə Keyfiyyət Təminatı Agentliyinin İdarə heyətinin sədri Ülkər Səttarova, Təhsilin İnkişafı Fondunun İdarə heyətinin sədri Elnur Nəsibov və Britaniya Şurasının Cənubi Qafqaz üzrə İmtahanlar Meneceri Nərgiz Əkbərova qeyd ediblər ki, bu imtahanların təşkilində məqsəd universitetlərdə beynəlxalq dil sertifikatlarının təşviqi, gələcəkdə tədris prosesində İELTS sertifikatı kimi akkreditasiya olunmuş beynəlxalq dil sertifikatına malik olan tələbələrin müvafiq proqramların tədrisindən azad olunmalarını stimullaşdırmaqdır. Xüsusilə vurğulanıb ki, ötən ilin sonunda 6 dövlət ali təhsil müəssisəsi ilə birgə icra olunan layihənin ilk ilində Pedaqoji Universitetdən namizədliyi irəli sürülmüş bütün müəllim və tələbələr yüksək nəticə ilə IELTS sertifikatı almağa müvəffəq olmuşlar və növbəti illərdə də layihə davam etdiriləcək.

Daha sonra müəllim və tələbələrə müvafiq sertifikatlar təqdim olunub.

## BP-NIN NƏŞR ETDİYİ 4 YENİ BEYNƏLXALQ DƏRSLİK TƏRCÜMƏSİNİN TƏQDİMATI KEÇİRİLİB

Yanvarın 26-da ADPU-nun Kitabxana-İnformasiya Mərkəzində BP beynəlxalq universitetlərdə geniş istifadə edilən dörd dərsliyin Azərbaycan dilinə tərcümə edilmiş nəşrlərini təqdim edib. Bu, BP tərəfindən Azərbaycan dilinə tərcümə edilmiş və yerli universitetlərə təqdim olunmuş əvvəlki 15 dərsliyə əlavədir. bunlar Rona Hartın "Pozitiv psixologiya", Çarlz A. O'Reyli və Malykl L.Tuşmanın "Liderlik et və qalib gəl: İnnovator dilemmasını necə həll etməli", Örl Bebbinin "Sosial tədqiqat praktikası" və Con Mallinsin "Yeni biznes yolu testi" kitablarıdır.




Kitablar BP-nin ən yaxşı beynəlxalq tədris vəsaitlərinin və təcrübəsinin Azərbaycana gətirilməsinə yönəlmiş böyük bir təhsil layihəsinin bir hissəsi olaraq tərcümə edilib və nəşr olunub. bp bu layihəni hazırda davam etdirir və əlavə 10 beynəlxalq universitet dərsliyinin tərcümə olunması və nəşri üzərində iş gedir. Azərbaycan dilinə tərcümə edilmək və nəşr olunmaq üçün seçilmiş bütün dərsliklər yerli universitetlər və müvafiq ekspertlər tərəfindən beynəlxalq bilik və təhsil təcrübəsi baxımından dəyərli mənbə kimi tövsiyə olunub. Bu kitablar dünyada ən geniş istifadə olunan dərsliklər sırasındadır və əksər aparıcı beynəlxalq universitetlərin icbari tədris vəsaitlərinin siyahısına daxildir.

Bu kitablar BP-nin yerli universitetlərə, kitabxanalara və müvafiq elm və təhsil müəssisələrinə hədiyyəsidir. Hər bir dərsliyin çap edilmiş 2000 nüsxəsi ilə yanaşı, rəqəmsal versiyası da yerli nəşriyyatın – TEAS PRESS Nəşriyyat Evinin onlayn platformalarında yerləşdirilib. Təqdimat mərasimində ADPU və bp Azərbaycan şirkətinin rəhbərliyi, millət vəkilləri, ali təhsil müəssisələrinin və təhsil ictimaiyyətinin nümayəndələri iştirak ediblər.

Çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov bp-nin tərcümə etdiyi növbəti beynəlxalq dərsliklərin təqdimatının ilk dəfə universitet kitabxanasında keçirilməsinin rəmzi məna daşıdığını qeyd edərək, bu tip sosial layihələrin təhsilin inkişafındakı önəmindən danışıb. Rektor vurğulayıb ki, ali təhsil müəssisələri ilə müzakirələr əsasında gələcəkdə də prioritet sahələrdə beynəlxalq səviyyədə tədris olunan dərsliklərin tərcümə və çap olunması diqqət mərkəzində saxlanılmaldır. C.Cəfərov deyib: "Bu vəsaitlərin ana dilimizdə təqdim olunması gənclərimizin dünya elminə birbaşa çıxış imkanını reallaşdırır." Təqdimat mərasimində çıxış edən BP-nin Xəzər regionunda kommunikasiya və xarici əlaqələr üzrə vitse-prezidenti Bəxtiyar Aslanbəyli bildirib ki, şirkətin ölkədə həyata keçirdiyi sosial layihələrin 80%-i təhsillə bağlıdır: "Bu kitablar yerli universitetlərin bəhrələnə biləcəyi daha bir dəyərli təhsil və tədris mənbəyidir. Layihə başa çatdıqda biz universitetlərimiz üçün qlobal biliklərlə zəngin 29 ən nüfuzlu beynəlxalq dərsliyə birbaşa çıxış təmin etmiş olacağıq. Çox məmnunuq ki, Bakıda və ölkənin digər şəhərlərində yerləşən 30-dan çox yerli ali təhsil müəssisəsinin tələbə və müəllim heyəti bu dərsliklərdən yararlana biləcək. Azərbaycanın etibarlı və uzunmüddətli tərəfdaşı kimi biz ölkədə təhsilin ümumi keyfiyyətinin artırılmasına yönəlmiş sosial layihələrə sərmayə qoymağa davam edəcəyik." "Təhsilə yatırılan investisiya daha asan geri qayıdır. Tərcümə etdiyimiz yeni kitablar kifayət qədər bahalıdır. Onların arasında qiyməti 148, hətta 182 ABŞ dolları olanlar da var. Bundan əvvəl tərcümə etdiyimiz bir kitabın dəyəri isə 700 dollar civarında idi. Bu günə qədər ölkəmizdə və ölkə hüdudlarından kənarda 65 min nüsxədən artıq kitabın oxucular arasında yayılmasına dəstk vermişik. Həmçinin "Rəqəmsal kitabxana" layihəsi çərçivəsində 29 mindən artıq kitab elektronlaşdırılıb.", – deyə o qeyd edib. Qeyd edək ki, hazırda davam edən layihənin ümumi dəyəri 2 milyon AZN-dən çoxdur.

## ŞAMAXI FİLİALINDA ELMİ-PRAKTİK KONFRANS



ADPU-nun Şamaxı filialı və Şamaxı rayon Heydər Əliyev Mərkəzinin birgə təşkilatçılığı ilə "Heydər Əliyev ili" və 2 Fevral – Azərbaycan Gəncləri Gününə həsr olunmuş "Heydər Əliyev müasir Azərbaycan gənclər siyasətinin banisidir" mövzusunda elmi-praktik konfrans keçirilib. İlk olaraq rayonda yerləşən Heydər Əliyev Parkında Ümummilli Lider Heydər Əliyevin abidəsi ziyarət olunaraq önünə gül dəstələri qoyulub. Ziyarətin ardınca filialda Ulu Öndər Heydər Əliyevin həyat və fəaliyyətini əks etdirən sərgiyə baxış keçirilib. Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi və Ulu Öndər Heydər Əliyevin və vətən uğrunda şəhid olan bütün gənclərimizin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə elmi-praktik konfrans açıq elan olunub. "Ulu Öndər və Azərbaycan gəncliyi" mövzusunda videoçarx nümayiş olunub. Tədbiri giriş sözü ilə açan filialın direktoru dosent Tünzalə Yusifova tədbir iştirakçılarını salamlayıb və tələbə-gəncləri gənclər günü münasibətilə təbrik edib. O, öz çıxışında Ulu Öndərin gəncliyə verdiyi dəyərdən və bu gün Heydər Əliyev siyasətinin uğurlu davamçısı olan Cənab Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə 44 günlük müharibədə zəfər çalan gənclərimizin göstərdiyi şücaətdən bəhs edib. Direktor qeyd edib ki, bizim gələcəyimiz bu gün gənclərə verilən təhsildən asılıdır və regionun yeganə ali təhsil müəssisəsi olaraq ADPU-nun Şamaxı filialı da üzərinə düşən bu vəzifəni uğurla yerinə yetirməyə hər zaman səy göstərir. Çıxış edən Heydər Əliyev Mərkəzinin direktoru Könül Eyvazova gənclər gününün tarixindən və Heydər Əliyevin gənclərə göstərdiyi diqqət və qayğıdan bəhs edib.

## "İLİN GƏNC ALİMİ VƏ TƏDQİQATÇISI" MÜSABİQƏSİNİN QALİBLƏRİ MÜKAFATLANDIRILIB



Fevralın 2-də ADPU-da Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş "İlin gənc alimi və tədqiqatçısı" müsabiqəsinin qaliblərinin mükafatlandırılması ilə bağlı tədbir keçirilib. Tədbirdə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov universitetin gənc alim və tədqiqatçılarını 2 Fevral - Gənclər Günü münasibəti ilə təbrik edərək, Ulu Öndərin 100 illiyinə həsr olunan müsabiqənin mükafatlandırma mərasiminin məhz Heydər Əliyevin təşəbüsü ilə qeyd olunan Azərbaycan Gəncləri Günündə keçirilməsinin rəmzi mənasına diqqət çəkib. Rektor qeyd edib ki, bütün sahələrdə olduğu kimi elmi-tədqiqat sahəsində də gənclərin aktiv iştirakı və davamlı stimullaşdırılmaları olduqca vacib məsələdir və bu istiqamətdə Pedaqoji Universitet də sistemli işlər görür. Çıxış edən elm və innovasiyalar üzrə prorektor prof. Asəf Zamanov müsabiqə haqqında məlumat verərək vurğulayıb ki, Heydər Əliyevin 100 illiyinə həsr olunan müsabiqə 2022-ci təqvim ili ərzində fəal, səmərəli elmi fəaliyyət göstərərək yüksək elmi nəticələrə nail olmuş, nüfuzlu jurnallarda dərc edilmiş elmi məqalələri, monoqrafiya, dərslik, dərs vəsaiti və digər elmi əsərləri olan, eyni zamanda ADPU-nun və filiallarının ictimai-siyasi həyatında elmi-təşkilati fəaliyyəti ilə fərqlənmiş doktorant və tədqiqatçıların müəyyənləşdirilməsi və mükafatlandırılması məqsədi ilə keçirilir. Bildirilib ki, qaliblər 2 nominasiya üzrə "İlin gənc alimi və tədqiqatçısı" adını alır, diplom və pul mükafatları ilə təltif edilirlər. Prorektor qeyd edib ki, cari ildə müsabiqəyə təqdim olunmuş 20 müraciət arasında aparılan seçimlər nəticəsində "Dəqiq və təbiət elmləri" nominasiyası üzrə b.ü.f.d. Bəsti Əsədova I, r.ü.f.d. Xədicə Qocayeva II, Zöhrə Əsgərova III, "Humanitar və ictimai elmlər" nominasiyası üzrə isə s.e.ü.f.d. Riyad Rüstəmli I, p.ü.f.d. Aysel Şeydayeva II, f.ü.f.d., b/m. Könül Həsənova isə III yerə layiq görülüb. Beynəlxalq əlaqələr üzrə prorektor prof. Mahirə Hüseynova, prof. Təyyar Salamoğlu, ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar Şurasının sədri İlkin Əsgərov, kafedra müdiri dosent Könül Səmədova və müsabiqə qalibləri elmin inkişafı üçün yaradılan münbit şəraitdən söz açıblar. Qeyd edək ki, müsabiqəyə təqdim olunan sənədlər ADPU Elmi Şurasının nəzdindəki Elm komissiyası tərəfindən təhlil edilərək, nəticələr müəyyən olunur. Müsabiqədə I yerin qaliblərinə 350 azn, II yerin qaliblərinə 250 azn, III yerin qaliblərinə isə 150 azn pul mükafatı verilir.

## GƏNC ƏMƏKDAŞLAR, MÜƏLLİMLƏR VƏ FƏAL TƏLƏBƏLƏR MÜKAFATLANDIRILDI

Fevralın 2-də ADPU-da 2 Fevral - Azərbaycan Gəncləri Günü münasibəti ilə universitet rəhbərliyi ötən il ərzində universitetin strukturlarında fəaliyyəti ilə xüsusi fərqlənən gənc əməkdaşlar, müəllimlər və tədrisdə, eləcə də sosial-ictimai həyatda xüsusi fərqlənən tələbələrlə görüş keçirib.

Görüşdə 41 nəfər gənc əməkdaş və müəllim, 12 nəfər yüksək akademik nəticələr əldə edən tələbə və 31 nəfər ictimai-sosial həyatda fəallığı ilə seçilən tələbə olmaqla, ümumilikdə 84 nəfərə universitet rəhbərliyi adından fəxri fərmanlar təqdim edilib.

Mükafatlandırma mərasimində çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov gəncləri təbrik edərək vurğulayıb ki, gəncləşdirmə siyasəti Pedaqoji Universitetin əsas prioritetləri arasındadır və gənc əməkdaşları stimullaşdırmaq məqsədi ilə görülən çoxsaylı tədbirlərlə yanaşı, bu il ilk dəfə olaraq bu mükafat gənc əməkdaş və müəllimlərə də verilməyə başlanılıb.



## TƏLƏBƏLƏR TƏLTİF EDİLİB

2 Fevral - Azərbaycan Gəncləri Günü münasibəti ilə keçirilən tədbirlər çərçivəsində il ərzində ölkənin ictimai həyatında fərqlənən gənclər müxtəlif qurumlar tərəfindən mükafatlandırılıblar. Belə gənclər arasında ADPU-nun da bir çox tələbəsi var.




Belə ki, ADPU Tələbə Gənclər Təşkilatının (TGT) sədri Təhmasib İmaməliyev Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) tərəfindən 2022-ci il ərzində ölkədə ictimai və sosial əhəmiyyətli, o cümlədən könüllü fəaliyyətin təşkili və bu fəaliyyətin həyata keçirilməsində fəal iştirakına görə "İlin Tələbə Gənclər Təşkilatı sədri" adına layiq görülüb, Nəsimi Rayon İcra Hakimiyyəti tərəfindən "Heydər Əliyev İli" çərçivəsində 2 Fevral – Gənclər Günü münasibəti ilə mükafatla və Səbail rayon Gənclər və İdman İdarəsi tərəfindən 2022-ci ildə ictimai fəaliyyət sahəsində əldə etdiyi nailiyyətlərə görə 2 Fevral – Azərbaycan Gəncləri Günü münasibətilə Fəxri Fərmanla təltif olunub. ADPU TGT-nin sədr müavinləri Bikəxanım Qulaməddinova və Günay İsmayılova ATGTİ tərəfindən 2022-ci il ərzində proqram əsaslı uğurlu fəaliyyətə verdiyi xüsusi töhfələrə görə 2 Fevral – Azərbaycan Gəncləri Günü münasibəti ilə "İlin TGT nümayəndəsi" adına layiq görülmüşlər. ADPU TGT-nin sədr köməkçisi Rizvan Mahmudov və ADPU TGT-nin mətbuat katibi Elmira Babayeva Səbail Rayon Gənclər və İdman İdarəsi tərəfindən 2022-ci ildə ictimai fəaliyyət sahəsində əldə etdiyi nailiyyətlərə görə 2 Fevral – Azərbaycan Gəncləri Günü münasibəti ilə Fəxri Fərmanla təltif ediliblər. ADPU Könüllüləri Təşkilatının sədr köməkçisi Aytən Abdullayeva isə Nəsimi Rayon İcra Hakimiyyətinin Fəxri Fərmanı ilə təltif olunub. Qeyd edək ki, həmçinin fevralın 2-də ADPU rəhbərliyinin gənc əməkdaşlar və fəal tələbələrlə görüşü çərçivəsində universitetij yüksək akademik göstəriciləri ilə fərqlənən 12 nəfər, ictimai fəaliyyətdə fərqlənən 31 nəfər tələbəsi Fəxri Fərmanla təltif olunub.

## MÜƏLLİM VƏ TƏLƏBƏLƏRİMİZ QARDAŞ ÖLKƏYƏ DƏSTƏKLƏRİNİ İFADƏ EDİRLƏR



Fevralın 6-da qardaş Türkiyə Respublikasında baş vermiş dəhşətli zəlzələ nəticəsində on minlərlə insan həlak olmuş, yüz minlərlə insan yaralanmış, minlərlə bina və evlər dağılmışdır.

Qardaş ölkənin 10 vilayətində yaranan fövqəladə vəziyyətin böyüklüyünü və kəskin hava şəraitini nəzərə alaraq, Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) də zəlzələdən zərər çəkənlərə humanitar yardım məqsədi ilə tələbə və əməkdaşları arasında yardım kampaniyasında iştirak etmək istəyənlərə şərait yaradılıb.

Kampaniyaya çərçivəsində fevralın 8-dən etibarən ADPU-nun tələbə və əməkdaşları universitetin Bakı şəhərində yerləşən tədris binalarına yaxınlaşaraq qardaş türk xalqına yardım üçün zəruri ləvazimatları təhvil verməyə başlayıblar. Toplanan yardımlar universitetin Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin əməkdaşları və tələbə təşkilatlarının könüllüləri tərəfindən çeşidlənərək müvafiq toplama məntəqəsinə təhvil verilib.

## TALIS 2023 SINAQ MƏRHƏLƏSİNƏ BAŞLANILIB

Azərbaycan TALIS (Teaching and Learning International Survey) beynəlxalq araşdırma tədqiqatının 2024-cü ildə keçirilməsi nəzərdə tutulan əsas mərhələsində iştirak edəcəkdir. Bununla bağlı 2023-cü il sınaq mərhələsinə hazırlıq prosesləri başlanılıb.




Hazırlıq mərhələsi Elm və Təhsil Nazirliyi və Pedaqoji Universitetin Strateji İnkişaf Mərkəzi tərəfindən həyata keçirilir.

Tədqiqatın pilot mərhələsi 2022-ci ildə baş tutmuşdur. 2023-cü il fevral-mart ayları ərzində Öyrətmə və öyrənmə üzrə beynəlxalq sorğunun - TALIS 2024 - sınaq mərhələsi keçiriləcəkdir. Bununla əlaqədar tədqiqatla bağlı maarifləndirici, təlimat xarakterli seminarların keçirilməsinə start verilmişdir. Bu məqsədlə ilk görüş paytaxt və regionlardan tədqiqatda iştirak edəcək ümumi təhsil müəssisələrinin direktorları ilə onlayn şəkildə təşkil edilmişdir.

Seminarda təqdimat edən ADPU-nun Strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (İƏİT) tərəfindən 2008-ci ildən etibarən hər beş ildən bir həyata keçirilən TALIS tədqiqatında ölkəmizin ilk dəfə iştirak etdiyini diqqətə çatdırmışdır. Tədqiqat müəllimlərin və məktəb direktorlarının məktəblərdəki iş şəraitinə və öyrənmə mühitinə istiqamətlənən ilk beynəlxalq sorğudur. Bu məqsədlə müəllim və direktor sorğusu olaraq iki növ sorğudan istifadə olunduğunu, bu sorğularda həm müəllimlərin, həm də direktorların hansı mövzular və prioritetlər ətrafında suallara cavab verəcəkləri müzakirə edilmişdir. K.Pirverdiyeva təqdimatda digər iştirakçı ölkələrin müxtəlif illər üzrə TALIS hesabatlarında qeyd olunan vacib çağırışları diqqətə çatdırmışdır. Seminar iştirakçıların sual-cavab sessiyası ilə davam etmişdir. Qeyd edək ki, ADPU Strateji İnkişaf Mərkəzi tərəfindən təşkil olunan və 1500 nəfərə yaxın müəllimin iştirak edəcəyi TALIS seminarları fevral ayının 14-nə kimi davam edəcək.

## ECAR LAYİHƏSİ ÇƏRÇİVƏSİNDƏ NÖVBƏTİ TƏLİMLƏR POLŞA RESPUBLIKASINDA KEÇİRİLİB



"Azərbaycanda Rektorlar Konfransının yaradılması" Erasmus+ layihəsi çərçivəsində növbəti təlimlər Polşa Respublikasında keçirilib 30 yanvar 2022-ci il – 3 fevral 2023-cü il tarxilərində ECAR layihəsi çərçivəsində Polşa Universitetlərinin Rektorlar Konfransı (CRASP) tərəfindən təşkil olunan səfərin məqsədi Polşa ali təhsil müəssisələrinin strateji inkişaf məsələlərinin öyrənilməsi olub.

Təlimlərdə Azərbaycanın layihə konsorsiumunun üzvü olan 20 ali təhsil müəssisəsinin prorektorları və digər səlahiyyətli nümayəndələri iştirak edib. Təlimdə Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) tədris işləri üzrə prorektoru, siyasi elmlər üzrə fəlsəfə doktoru, dosent Eldar Aslanov təmsil edib.

İlk iki gün Kozminski Universitetində keçirilən təlimlərdə universitetin ümumi inkişaf, dayanıqlı inkişaf, rəqəmsal tranformasiya strategiyaları, həmçinin əməkdaşların təkmilləşdirilməsi ilə bağlı yerli və Avropa layihələri üzrə təcrübələri öyrənilib.

Növbəti günlərdə baş tutan tədbirdə Varşava Həyat Elmləri Universitetinin rektoru və Polşa Universitetlərinin Rektorlar Konfransının vitse-prezidenti cənab Michal Zasada tərəfindən strateji planlamada insan resurslarının idarəedilməsi, maliyyənin idarəedilməsinin əsas kriteriyaları, o cümlədən CRASP-ın fəaliyyəti ilə ətraflı məlumat verilib. Həmçinin CRASP-ın baş katibi Agata Kulesza səfər iştirakçıları ilə CRASP-ın milli və beynəlxalq təcrübələri ilə bağlı ətraflı fikir mübadiləsi aparıb.

Həyata keçirilən təlim-seminarlarda Varşava Həyat Elmləri universitetinin əməkdaşları tərəfindən strateji inkişaf və keyfiyyət məsələlərinin qarşılıqlı əlaqəliliyi, Polşa ali təhsil müəssisələrində monitorinq və qiymətləndirmə prosesləri, strateji idarəetmə üzrə akkreditasiya meyarları kimi mühüm mövzularda müzakirələr aparılıb. Təlim proqramı çərçivəsində Varşava Universitetinin əməkdaşı Şəhla Kazımova tərəfindən Universitetdə Azərbaycan dilinin tədrisi, Azərbaycan mədəniyyətinin təbliği, elmi konfranslar və digər tədbirlər haqqında ətraflı təqdimat həyata keçirilib.

Səfər çərçivəsində Azərbaycan ali təhsil müəssisələrinin nümayəndələri Azərbaycanın Polşadakı səfiri Nərgiz Qurbanova ilə görüşüb. Görüşdə xanım səfir Polşada, xüsusilə ali məktəblərdə həyata keçirilən sosial-mədəni tədbirlər, layihələr haqqında məlumatlar verib. N.Qurbanova universitetlərimizi Polşa ali təhsil müəssisələri ilə əməkdaşlığı daha da gücləndirməyə dəvət edib və bu istiqamətdə müvafiq dəstəyin göstərilə biləcəyini ifadə edib. Təlim proqramının yekununda Bakı Biznes Universitetinin mərkəz direktoru, layihənin koordinatoru Gülşən Bayramovanın moderatorluğu ilə ECAR layihəsi çərçivəsində pilot olaraq yaradılan Strateji inkişaf komitəsinin sədri Araz Aslanlı ilə birlikdə layihədə həyata keçirilən fəaliyyətlərin icası və qarşıda duran mühüm tapşırıqlar, Stratji İnkişaf Komitəsinin gələcək fəaliyyət planı üzrə müzakirələr aparılıb.

## GƏNC ALİMLƏR VƏ TƏDQİQATÇILAR ŞURASININ İDARƏ HEYƏTİNİN NÖVBƏTİ İCLASI KEÇİRİLİB



Fevralın 13-də ADPU Gənc Alimlər və Tədqiqatçılar Şurasının İdarə Heyətinin növbəti iclası keçirilmişdir. İclasda əvvəlcə fevralın 6-da qardaş Türkiyə Respublikasında baş vermiş dəhşətli zəlzələ nəticəsində dünyasını dəyişmiş insanların xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir. Çıxış edən universitetin elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov bildirdi ki, Respublikada icra olunan uğurlu gənclər siyasəti ADPU-da da səylə davam etdirilir. Prorektor qeyd edib ki, 12 yanvar 2022-ci il tarixində yeni tərkibdə formalaşdırılmış Şura ADPU-da və onun filiallarında çalışan və təhsil alan gənc alim və tədqiqatçıların elmi fəaliyyətlərinin təşkili və əlaqələndirilməsinə yardım etmək, onların yaradıcı elmi və innovasiya fəaliyyətlərini inkişaf etdirmək istiqamətində mühüm rola malikdir. Prof. A.Zamanov diqqətə çatdırıb ki, 2022-ci təqvim ilində Universitet rəhbərliyinin və Şuranın təşkilatçılığı, təşəbbüsü ilə gənc alim və tədqiqatçılar arasında "İlin gənc alimi və tədqiqatçısı" müsabiqəsinin keçirilməsi də gənc alimlərin stimullaşdırılmasında xüsusi əhəmiyyət daşıyır. İclasda ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar Şurasının sədri, filologiya üzrə fəlsəfə doktoru İlkin Əsgərovun 2022-ci təqvim ilinin yekunlarına həsr olunmuş hesabatı dinlənilib. Bildirilib ki, il ərzində ADPU-da gənc alim və tədqiqatçıların Respublika və beynəlxalq səviyyəli elmi konfrans, seminar, qurultay, forum, sərgi və digər tədbirlərdə iştiraka cəlb edilməsi istiqamətində də mühüm işlər görülmüşdür. Belə ki, 2022-ci təqvim ilində universitetin 40 yaşa qədər olan gənc alim və tədqiqatçıları 87 Respublika, 235 Beynəlxalq səviyyəli elmi konfransda iştirak etmişdir. Bundan başqa, gənc alim və tədqiqatçıların Respublikada nəşr olunan və eləcə də beynəlxalq nüfuzlu jurnallarda ümumilikdə 145 məqaləsi çap olunmuşdur, Şura üzvlərindən 11 nəfər fəlsəfə doktorluğu dissertasiyasını müdafiə etmiş, 6 nəfər fəlsəfə doktoru alimlik dərəcəsi diplomu almışdır. Filologiya üzrə fəlsəfə doktoru Könül Həsənova, tarix üzrə fəlsəfə doktoru Taleh Cəfərov, pedaqogika üzrə fəlsəfə doktoru Xəyalə Məmmədova və digər tədbir iştirakçıları çıxış edərək hesabatla bağlı fikir və təkliflərini bildirmiş, fəaliyyət planında icrası nəzərdə tutulmuş məsələlərin gənc alim və tədqiqatçılar üçün əhəmiyyətindən danışmışlar. Sonda İdarə Heyətinin üzvləri fəaliyyət planına uyğun olaraq 2023-cü təqvim ilindən başalayaraq hər il 5 Oktyabr Beynəlxalq Müəllimlər Günü ərəfəsində ADPU-da "İlin gənc müəllimi" müsabiqəsinin keçirilməsi üçün universitet rəhbərliyinə müraciət etməyi qərara almışlar. Yekunda təqdim olunmuş hesabat Şuranın İdarə Heyəti tərəfindən qəbul edilmişdir. Hesabatın dinlənilməsindən sonra Şuranın 2023-cü təqvim ili üçün fəaliyyət planı müzakirə edilib və qəbul olunub. İclasda, həmçinin filologiya üzrə fəlsəfə doktoru Könül Həsənova Şuranın İdarə Heyətinə üzv seçilib.

## MƏKTƏBƏQƏDƏR TƏHSİL İLƏ BAĞLI DƏYİRMİ MASA



ADPU və Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin "Məktəbəqədər və ibtidai təhsil" jurnalının birgə təşkilatçılığı ilə "Məktəbəqədər təhsil müəssisələrinin fəaliyyət planının müzakirəsi" mövzusunda dəyirmi masa keçirilib.

Dəyirmi masada ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin, Azərbaycan Respublikası Təhsil İnstitutunun, "Məktəbəqədər və ibtidai təhsil" jurnalının əməkdaşları və Bakı, Sumqayıt, Abşeron və digər regionların məktəbəqədər təhsil müəssisələrinin müdir və tərbiyəçi-müəllimləri iştirak ediblər.

## ADPU-NUN ÖZÜNÜTƏHLİL HESABATI TƏSDİQ EDİLİB



Fevralın 14-də ADPU-nun Elmi Şurasının növbəti iclası keçirilib. İclası açan Elmi Şuranın sədri, ADPU-nun rektoru professor Cəfər Cəfərov Pedaqoji Universitet kollektivi adından fevralın 6-da Türkiyə Respublikasında baş vermiş dəhşətli zəlzələ ilə bağlı qardaş türk xalına və dövlətinə başsağlığı verib, qüdrətli türk xalqının əl-ələ verərək qısa zamanda bu fəlakətin fəsadlarını aradan qaldıracağına inamı ifadə edərək, hər zaman qardaşlarımızın yanında olduğumuzu vurğulayıb.

Gündəlikdəki məsələlərə keçməzdən əvvəl rektor tərəfindən son dövrlərdə elmi ad və dərəcələr alan əməkdaşlardan Azərbaycan dilçiliyi kafedrasının professoru fil.e.d. Həcər Hüseynovaya professor, Biologiya və onun tədrisi texnologiyası kafedrasının dosenti p.ü.f.d. Pərvin Qafarovaya dosent attestatı, Filologiya fakültəsinin dekan müavini fil.ü.f.d. Könül Həsənova, Ümumi pedaqogika kafedrasının müəllimi p.ü.f.d. Fəridə Xudiyeva, Elmi tədqiqat mərkəzinin əməkdaşı p.ü.f.d. Aynur Qafarlı və Quba filialının direktor müavini p.ü.f.d. Aysel Şeydayevaya isə fəlsəfə doktoru diplomları dəqdim edildi.

Daha sonra tədris işləri üzrə prorektor dosent Eldar Aslanov ADPU-nun institusional akkreditasiyası ilə əlaqədar özünütəhlil hesabatının təsdiqi barədə məruzə ilə çıxış edib.

Məruzədə qeyd olunub ki, ADPU-da son akkreditasiya 2015-ci ildə olmuş və 7 iyun 2016-cı ildə ADPU müəllimlik ixtisasları üzrə bakalavr hazırlamaq, pedaqoji ixtisaslar üzrə magistr hazırlamaq üçün akkreditasiya şəhadətnaməsi almışdır. 2019-cu ilin sonunda növbəti 5 il üçün ADPU-nun akkreditasiyası yenidən başlamış, lakin pandemiya səbəbindən proses yarımçıq qalmışdır. 14 noyabr 2022-ci ildə TKTA-nın məktubu əsasında institusional akkreditasiya prosesinə start verilmişdir. Akkreditasiyaya hazırlıq üçün TKTA ilə təlim xidmətləri üzrə müqavilə imzalanmışdır. ADPU-da 22 noyabr 2022-ci il tarixində özünütəhlil üzrə Təşkilat komissiyası yaradılmışdır. Komissiyanın fəaliyyəti nəticəsində universitetin bütün strukturlarının son 7 illik fəaliyyətini əks etdirən ümumilikdə 169 səhifəlik özünütəhlil hesabatı hazırlanmışdır.

Özünütəhlil hesabatı ilə tanışlıqdan sonra Elmi Şura hesabatın təsdiq olunaraq müvafiq orqana təqdim olunması haqqında qərar qəbul edib.

Cari məsələlərin müzakirəsində elm və innovasiyalar üzrə prorektor prof. Asəf Zamanovun magistrların dissertasiya işlərinin təsdiqi, dərs vəsaitlərinin nəşrinə icazə verilməsi, elmlər doktorluğu və fəlsəfə doktorluğu proqramları üzrə dissertasiya mövzuları və elmi rəhbərinin təsdiqi və dəyişdirilməsi ilə bağlı təqdimatları və Tədris Departamentinin direktoru dos. Sənan Əliyevin 2022-2023-cü tədris ili üçün ADPU-da pedaqoji təcrübənun təşkili haqqında məlumatı dinlənilmişdir.

## MBA VƏ SABAH MAGİSTRATURASI ÜZRƏ İLK ELMİ-TƏDQİQAT VƏ İSTEHSALAT TƏCRÜBƏLƏRİ TƏŞKİL OLUNUR




Fevralın 16-da ADPU-da magistrantların Elmi-tədqiqat təcrübəsinin başlanmasına həsr olunmuş konfrans keçirilib.

Açılış nitqi ilə çıxış edən rektor professor Cəfər Cəfərov təcrübəyə başlayacaq tələbələrə uğurlar arzulayaraq qeyd edib ki, son dövrlərdə universitetdə ali təhsilin bütün sahələri üzrə kadr hazırlığında əsaslı irəliləyiş müşahidə olunur, dövrün trendlərinə uyğun olaraq yeni ixtisaslar yaradılır. Rektor qeyd edib ki, "Təhsilin təşkili və idarə olunması (MBA)" və "Təlim və tədrisin təşkili və metodikası (SABAH)" magistratura ixtisaslaşmaları üzrə bu il ilk buraxılışlar olacaq və hər iki ixtisaslaşma üzrə ilk elmi-tədqiqat və istehsalat təcrübəsi təşkil olunur. Çıxış edən elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov vurğulayıb ki, universitetdə magistr hazırlığının keyfiyyətini artırmaq məqsədi ilə artıq ikinci ildir ki, magistrantların xarici ölkə universitetlərində də təcrübə keçməsinə başlanılıb. Prorektor bildirib ki, magistrantların dissertasiya mövzuları arasında ali təhsilin idarəolunmasının aktual məsələlərinə xüsusi yer verilir və universitetin rəhbər heyəti şəxsən bu mövzulara elmi rəhbərlik edir. Elmi-tədqiqat təcrübəsinin təşkili barədə geniş məlumat verən Magistratura və doktorantura şöbəsinin müdiri s.e.ü.f.d. Rəşad Sadıqov qeyd edib ki, 2022-2023-cü tədris ilində ümumilikdə 22 ixtisas üzrə 26 ixtisaslaşmada təhsil alan 290 nəfər II tədris ilinin magistrantı ADPU-nun 23 kafedrasında və müvafiq qurumlarda elmi-tədqiqat və istehsalat təcrübəsində iştirak edəcək. Şöbə müdiri qeyd edib ki, "Təhsilin təşkili və idarə olunması (MBA)" və "Təlim və tədrisin təşkili və metodikası (SABAH)", "Təhsildə monitorinq və qiymətləndirmə" və "Təhsil menecmenti" ixtisaslaşmaları ixtisasları üzrə təhsil alan tələbələrin təcrübələrində müəyyən fərqlər də olacaq, onlar tədqiqat layihələrində iştirak edəcəklər.

Qeyd edək ki, elmi-tədqiqat təcrübəsi 16 fevral-16 mart 2023-cü il tarixləri aralığında 4 həftə davam edəcək. Elmi-tədqiqat təcrübəsinin nəticəsində magistrant davamiyyətə görə maksimum 20 bal, fərdi iş planının tərtibinə görə maksimum 20 bal, elmi seminarda iştirakı və məruzə ilə çıxışına görə maksimum 20 bal, təcrübə dövründə məqalə hazırlanmasına görə maksimum 30 bal, dissertasiya mövzusu ilə bağlı yeni ədəbiyyatla tanışlığa görə maksimum 10 bal olmaqla, ümumilikdə mümkün 100 balla qiymətləndirilir. Elmi-tədqiqat təcrübəsinin 25%-dən çoxunda iştirak etməyən magistrant təcrübədən keçməmiş hesab edilir.

Sonda təcrübə ilə bağlı fikirlərini bölüşənlərdən professor Mübariz Əmirov, professor Müseyib İlyasov, professor İsa İsmayılov və magistrant Nurxan Rəcəbli magistr hazırlığında keyfiyyətin yüksəldilməsindən, magistrantların iş və tədqiqat imkanlarının genişləndirilməsindən söz açıblar.

## TƏLƏBƏLƏRİMİZ "AZERBAIJAN BRITISH COLLEGE" TƏHSİL KOMPLEKSİNDƏ TƏCRÜBƏ KEÇƏCƏK

Fevralın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) fakültələrində pedaqoji təcrübə keçəcək sonuncu tədris ili tələbələrinin pedaqoji təcrübələrinin başlanmasına həsr olunmuş konfranslar keçirilib. Konfranslarda fakültə rəhbərlikləri sonuncu tədris ili tələbələrinə pedaqoji təcrübənin qaydaları haqqında ətraflı məlumat verərək, tələbələrin təcrübə keçəcəkləri hər bir məktəbə ixtisas üzrə metodistlərin, pedaqoq və psixoloqların təhkim olunduğunu diqqətə çatdırıblar. Tələbələr təcrübə müddətində öz pedaqoji bacarıqlarını praktik olaraq tətbiq edəcək, məktəblərdə sınaq və icmal dərsləri keçəcəklər. Qeyd edək ki, ADPU-da 2022/2023-cü tədris ilinin yaz semestrində pedaqoji təcrübə 16 fevral – 24 may 2023-ci il tarixləri arasında təşkil ediləcəkdir. Pedaqoji təcrübədə ADPU-nun fakültələri, ADPU nəzdində ADPK, filiallar, Magistratura və doktorantura şöbəsi üzrə ümumilikdə 4.438 tələbə iştirak edəcək.







ADPU üzrə 2022/2023-cü tədris ilinin pedaqoji (istehsalat) təcrübəsi 14 həftə müddətində və çoxtərəfli müqavilələrə əsasən keçirilir. Tələbələrin təcrübələri Elm və Təhsil Nazirliyinin tabeliyindəki 7 müəssisədə, Bakı şəhəri üzrə Təhsil İdarəsinin tabeliyindəki 103 ümumtəhsil və 9 məktəbəqədər təhsil müəssisəsində, habelə 14 özəl müəssisədə, eyni zamanda beynəlxalq təhsil müəssisəsi olan "Azerbaijan British College" Təhsil Kompleksində (ikitərəfli müqavilə əsasında) təşkil olunur. Sosial iş ixtisası üzrə təhsil alan 57 tələbədən 10 nəfəri Azərbaycan Respublikasının Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin tabeliyində Dövlət Tibbi-Sosial Ekspertiza və Reabilitasiya Agentliyi və DOST İnkluziv İnkişaf və Yaradıcılıq Mərkəzində, 47 nəfəri isə Azərbaycan Respublikasının Gənclər və İdman Nazirliyinın tabeliyindəki Gənclər evlərində istehsalat təcrübəsində olacaqlar. "Azerbaijan British College" Təhsil Kompleksində pedaqoji təcrübə keçəcək müxtəlif ixtisaslarda təhsil alan 10 tələbə bu yaxınlarda "British Council" tərəfindən keçirilən IELTS imtahanlarında nailiyyət əldə edərək müsabiqə yolu ilə həmin məktəbdə təcrübə kecmək şansı qazanıblar.

## PEDAQOJİ UNİVERSİTETDƏ QƏRBİ AZƏRBAYCANA QAYIDIŞLA BAĞLI İLK İCTİMAİ DİNLƏMƏ KEÇİRİLDİ



Fevralın 21-də ADPU-da Beynəlxalq əlaqələr üzrə prorektorluğun təşkilatçılığı ilə Qərbi Azərbaycan İcmasının (QAİ) İdarə Heyətinin üzvləri ilə universitetin professor-müəllim heyəti və tələbələrin görüşü keçirilib. Tədbiri giriş sözü ilə açan ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, QAİ İdarə Heyətinin üzvü professor Mahirə Hüseynova görüşün məqsədi barədə məlumat verərək, Qərbi Azərbaycan həqiqətlərinin həm daxili, həm də xarici auditoriyaya çatdırılmasının vacibliyini vurğulayıb. Prorektor qeyd edib ki, Pedaqoji Universitetdə keçirilən bugünkü görüş geniş ictimaiyyət arasında Qərbi Azərbaycana qayıdışla bağlı ilk ictimai dinləmədir və belə müzakirələr bütün ictimai qurumlarda təşkil olunmalıdır. QAİ-nin sədr müavini, Azərbaycan Respublikası Milli Məclisin deputatı Hikmət Babaoğlu çıxışında bildirib ki, bu ilk ictimai dinləmənin Beynəlxalq Ana Dili Günü ilə üst-üstə düşməsi heç də təsadüfi deyil. Deputat vurğulayıb ki, dil məsələsi xalqın milli birliyinin vacib simvollarından biridir və bu gün Qərbi Azərbaycana qayıdış aspektində, bu mühüm vəzifənin icrası ilə bağlı Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin irəli sürdüyü vəzifələr kontekstində dilimizin qorunması, Qərbi Azərbaycanda anadilli toponimlərin, dil abidələrinin tətqiqi və təbliği olduqca önəmlidir. H.Babaoğlu qeyd edib ki, bu ilin yanvarında təsdiq olunan "Qərbi Azərbaycana Qayıdış Konsepsiyası"nın məzmunu ötən ilin 24 dekabr tarixində cənab Prezident İlham Əliyev icma üzvləri ilə görüşündə irəli sürdüyü tezislərə əsaslanır. İcmanın konsepsiyasının əsasını öz yaşayış yerlərindən didərgin salnmış azərbaycanlıların Qərbi Azərbaycana qayıdışını təmin etmək, eyni zamanda bölgədə azərbaycanlıların siyasi, hüquqi və fiziki təhlükəsizliklərinin təmini üçün bölgədə etimad edilən beynəlxalq sülhməramlı qüvvələrin yerləşdirilməsi və Ermənistan konstitusiyasında qərbi azərbaycanlıların hüquqlarının təsbiti, kompakt yaşayışın təmini kimi məsələlər təşkil edir. QAİ Qadınlar Şurasının sədri, Milli Məclis Əmək və Sosial Siyasət Komitəsinin sədr müavini Məlahət İbrahimqızı, millət vəkili Etibar Əliyev və digərləri çıxışlarında vurğulayıblar ki, siyasi aspektdən Azərbaycan tarixində heç vaxt belə bir əlverişli şərait olmayıb. Bu gün son 200 ildə Azərbaycan xalqının başına gətirilən faciələrin cavabının tapılması, haqq səsimizin dünyaya çatdırılması və tapdalanan haqlarımızın bərpası üçün bu gün münbit şərait yaranıb. Qeyd olunub ki, sovetlər imperiyasının dağılması ilə ermənilərin böyük Ermənistan xülyasının son həddi kimi Qərbi Azərbaycanda və daha sonra Dağlıq Qarabağda baş verən hadisələr təkcə yüzminlərlə soydaşımızın didərgin olması ilə deyil, eyni zamanda torpaqlarımızın 20 faizinin işğal olunması ilə nəticələndi. Buna görə də əvvəldə ərazi bütövlüyümüzün bərpası ən vacib vəzifə idi. Ulu Öndər Heydər Əliyev və cənab Prezident İlham Əliyevin apardıqları yorulmaz mübarizənin nəticəsində 2 il öncə Azərbaycan xalqı dünya tarixində görünməmiş bir qələbəyə imza atdı. Çıxışlarda bildirilib ki, Vətən müharibəsindəki tarixi zəfərimiz Qərbi Azərbaycanda ermənilər tərəfindən xalqımıza qarşı törədilən tarixi ədalətsizliyin aradan qaldırılması üçün təşkilatlanmış fəaliyyətə başlamağa imkan verdi. Sözsüz ki, 1989-cu ildə Azərbaycan Qaçqınlar Cəmiyyəti kimi yaradılan QAİ bu günə qədər də böyük işlər görüb, lakin Qarabağ probleminin həlli İcma kimi daha sistemli mübarizə aparmağa və beynəlxalq səviyyədə haqq səsimizi bəyan etməyə əsas yaratdı. Cənab Prezidentin xeyir-duası ilə hazırlanan qayıdış konsepsiyası BMT və onun ali qurumları tərəfindən BMT-nin gündəliyinə daxil olan sənəd kimi yayımlandı və bu dünya arenasında böyük əks-səda oyatdı. Çıxışlardan sonra suallar və təkliflər dinlənilib, qarşıda duran vəzifələrlə bağlı geniş müzakirələr aparılıb.

## "AZƏRBAYCAN XALQINA VƏ DÖVLƏTÇİLİYİNƏ HƏSR OLUNAN ÖMÜR" ADLI TƏDBİR



Fevralın 22-də ADPU-da Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Ü.Hacıbəyli - 68" ƏPT-nın təşkilatçılığı ilə "Heydər Əliyev ili" çərçivəsində "Azərbaycan xalqına və dövlətçiliyinə həsr olunan ömür" adlı tədbir keçirilib.

Tədbirdə ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, AMEA-nın müxbir üzvü Novruz Quliyev, professor Hacan Hacıyev, YAP Səbail rayon təşkilatının sədr müavini Nicat Hüseynov, "Ü.Hacıbəyli - 68" ƏPT-nın sədri dosent Sultanəli Qurbanov, habelə müəllim və tələbələr iştirak ediblər. Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayan tədbirdə Ümummilli Lider Heydər Əliyevin, vətənimizin bütövlüyü uğrunda canlarından keçən şəhidlərimizin və qardaş Türkiyə Respublikasında baş vermiş dəhşətli zəlzələlərdə həyatını itirənlərin xatirələri bir dəqiqəlik sükutla yad edilib. Daha sonra Heydər Əliyevin həyat və fəaliyyətinə həsr olunan videoçarx nümayiş olunub.

Tədbirdə çıxış edənlər Ulu Öndərin fövqəlbəşəri dühasının müxtəlif aspektləri haqqında söz açaraq, Heydər Əliyevin təkcə Azərbaycana müstəqillik qazandıran böyük xilaskar kimi deyil, eyni zamanda cəmiyyət həyatının bütün sahələrinə xüsusi diqqət yetirən, bu gün hər bir vətəndaşımıza, xüsusən hər bir gəncimizə örnək olan milli və ümumbəşəri dəyərləri özündə cəmləşdirən unikal bir şəxsiyyət olduğu qeyd olunub. Çıxışlardan sonra Filologiya fakültəsinin tələbəsi Aytac Muradlının ifasında vətənpərvərlik mövzusunda şeir dinlənilib. Sonda YAP-a yeni üzv olan müəllim və tələbələrə partiya biletləri təqdim olunub.

## ŞƏKİ FİLİALININ TƏLƏBƏSİ RESPUBLİKA ÜÇÜNCÜSÜ OLDU



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialının "Xarici dil müəllimliyi (ingilis dili üzrə)" ixtisasının IV tədris ilinin tələbəsi Elcan Səlimli növbəti uğurunu qazanıb. Ali məktəblərin magistratura səviyyəsinə qəbul üçün keçirilən imtahanlarda iştirak edən Elcan 96 bal toplayaraq, Respublika üçüncüsü, ölkənin regionları üzrə isə ən yüksək nəticəyə sahib olub. Elcan Səlimli fransız dilindən 23 düzgün cavabla Respublika üzrə maksimum nəticəni əldə edib, eyni zamanda ixtisası "Xarici dil müəllimliyi (ingilis dili üzrə)" olduğu üçün fərqli dili xarici dil kimi seçməklə imtahan verərək, magistratura tarixində 96 bal toplayan ilk tələbədir.

Qeyd edək ki, Elcan orta təhsili qızıl medalla başa vurub, ADPU-nun Şəki filialına 2019-cu ildə 660.6 balla qəbul olunub. Respublika fənn olimpiadasının gümüş medalçısıdır. Dörd il müddətində ali məktəbdə də "əla" qiymətlərlə təhsil alıb, "Gələcəyin müəllimi" təqaüdçüsüdür, sonuncu semestrin imtahan sessiyasının nəticələrinə əsasən, ümumi orta müvəffəqiyyət göstəricisi (ÜOMG) 98.5 olub.

## ŞAHDAĞ MİLLİ PARKININ ƏMƏKDAŞLARI İLƏ GÖRÜŞ

Tədbirdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının direktoru f.e.d. Yusif Alıyev, Şahdağ Milli Parkının müdir müavini Rəvayət Nəzərov, elmi işçi Şahbala Salmanov və filial əməkdaşları iştirak etmişdilər.

Tədbiri giriş sözü ilə açan filialın Təbiət elmləri kafedrasının müdiri v.m.i.e. dosent Güləddin Həmzəyev Yer kürəsində və dünyada canlı aləmin yaranmasında suyun əvəzsiz rolunu geniş şəkildə izah etdi. Daha sonra çıxış edən Milli Parkın elmi işçisi Ş.Salmanov Böyük Qafqazın şimal-şərq yamacının coğrafi quruluşu və burada yerləşən göllər haqqında danışdı, Şahdağ Milli parkının yaranması, fəaliyyət sahələri və ekoloji durum haqqında tədbir iştirakçılarını məlumatlandırdı.

Tədbirin sonunda çıxış edən filialın direktoru f.e.d. Y.Alıyev tədbir iştirakçılarını su çərşənbəsi münasibəti ilə təbrik edərək, görüşün



əhəmiyyətindən danışdı. Direktor bildirdi ki, Şahdağ Milli Parkı və filial arasındakı əməkdaşlığın təməllərinin atıldığı bu görüşün gələcəkdə daha da genişləndirilməsi üçün səylərimizi daha da artırmalıyıq. Bioloji müxtəlifliyin qorunmasına nəzarət və nəsli kəsilməkdə olan canlıların qeydiyyata alındığı Qırmızı Kitabın zamanla səhifələrinin daha da azalmasını arzu edən Y.Alıyev qeyd etdi ki, bu işdə qonaqlarımızın da əməyi danılmazdır.

Sonda Milli Parkın müdir müavini Rəvayət Nəzərov tərəfindən filiala Qırmızı kitab hədiyyə edildi.

## TÜRKSOY KAFEDRASI - 5 İL



Fevralın 22-də ADPU-da TÜRKSOY kafedrasının fəaliyyətə başlamasının 5 illiyi münasibətilə tədbir keçirilib. Tədbirdə Beynəlxalq Türk Mədəniyyəti Təşkilatının (TÜRKSOY) baş katibi professor Sultan Raev, Azərbaycanın TÜRKSOY-dakı daimi nümayəndəsi Elçin Qafarlı, akademik Teymur Kərimli, Azərbaycan Respublikası Mədəniyyət Nazirliyinin Beynəlxalq təşkilatlarla əməkdaşlıq sektorunun müdiri Araz Bağırlı, ADPU-nun rektoru professor Cəfər Cəfərov, universitetin prorektor və dekanları, kafedranın əməkdaşları və professor-müəllim heyəti, tələbələr iştirak edirdilər. Əvvəlcə qonaqlar ADPU-nun TÜRKSOY kafedrasının fəaliyyəti ilə yaxından tanış olublar. Sonra tədbir dəyirmi masa ətrafında davam etdirilib.

Giriş nitqi ilə çıxış edən rektor prof. Cəfər Cəfərov qonaqları salamlayaraq, əlamətdar tədbirdə Bakıda səfərdə olan TÜRKSOY-un baş katibi prof. Sultan Rayevin şəxsən iştirakının universitetə və kafedranın Türk dünyasının birliyinə xidmət edən məhsuldar fəaliyyətinə verilən dəyər olduğunu vurğuladı.

Rektor qeyd etdi ki, ötən ildən təşkilata rəhbər seçilən yeni baş katib ilk səfərlərindən birini Azərbaycana edib. Daha sonra prof. S.Raev haqqında geniş məlumat verərək, onun Qırğızıstan Respublikasının görkəmli mədəniyyət xadimi və ədəbi simalarından biri, Qırğızıstanın xalq yazıçısı olduğunu, buna qədər YUNESKO-da aktiv fəaliyyət göstərdiyini, Türk Dövlətləri Təşkilatının (TDT) baş katibinin müavini kimi məsul vəzifəni icra etdiyini diqqətə çatdırdı. Prof. C.Cəfərov vurğuladı ki, dünyada bir neçə universitetdə fəaliyyət göstərən TÜRKSOY kafedrasının illərindən biri Azərbaycanda məhz ADPU-dadır. Çıxış edən TÜRKSOY-un baş katibi prof. Sultan Raev universitet kollektivini salamlayaraq, burada olmaqdan məmnunluğunu ifadə edib. Baş katib bildirdi ki, bu il ADPU ilə TÜRKSOY arasında imzalanan əməkdaşlıq müqaviləsindən 5 ildən çox müddət keçir və bu vaxt ərzində yaradılan ayrıca kafedra xeyli uğurlu fəaliyyət göstərmişdir. Kafedranın türk dünyası akademik mühitinə verdiyi töhfələrdən söz açan prof. S.Raev 2022-ci ildə Nizami Gəncəvinin 880 illiyi çərçivəsində kafedra əməkdaşları tərəfindən böyük alim A.E.Krımskinin "Nizami və müasirləri" əsərinin ilk dəfə Azərbaycan dilinə tərcümə edilərək nəşr olunduğunu və nəşrin yüksək elmi səciyyə daşıdığını vurğuladı. Baş katib bildirdi ki, eyni zamanda TÜRKSOY-un 30 illik yubileyi ərəfəsində türk dünyasının böyük aydınlarından Almaz İldırım irsinin təbliği məqsədi ilə onun 115 illiyinə töhfə kimi seçmə şeirləri təşkilatın nəşri kimi çap edilib və bugünkü tədbirdə əsər təqdim olunacaq. ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, TÜRKSOY kafedrasının rəhbəri professor Asəf Zamanov "TÜRKSOY kafedrası – 5 il" mövzusunda məruzəsində məlumat verdi ki, ADPU-da TÜRKSOY kafedrası 2017-ci ilin dekabrın 7-də yaradılıb və ötən dövrdə kafedrada türk dünyasının önəmli simalarının irsinə həsr olunmuş tədbirlər, konfranslar, simpoziumlar keçirilmişdir. Prorektor kafedranın əsas məqsədlərindən birinin türk dünyasının elm-mədəniyyət xadimləri və türk dünyası ali təhsil ocaqları arasında əlaqələrin qurulmasında koordinasiya mərkəzi rolu oynamaq olduğunu qeyd elədi. Prof. A.Zamanob vurğuladı ki, kafedranın fəaliyyəti nəticəsində indiyədək universitetdə Abay Kunanbayev, Nizami Gəncəvi, Mustay Kərim kimi görkəmli şəxsiyyətlərin yubileylərinin yüksək səviyyədə qeyd olunub, eyni zamanda kafedra tərcümə işləri ilə məşğul olmuşdur, prof. Asəf Zamanov və dos.Təhminə Bədəlova tərəfindən ilk dəfə Azərbaycan dilinə tərcümə olunan, akad. Teymur Kərimlinin elmi redaktəsi ilə nəşr olunan "Nizami və müasirləri" əsəri bu yaxınlarda TÜRKSOY tərəfindən türk dilinə də tərcümə olunub. Prorektor vurğulayıb ki, kafedranın 2023-cü il üçün fəaliyyət planı şəxsən cənab baş katib və ADPU rektoru tərəfindən imzalanıb. Sonra akad. T.Kərimli monoqrafiyanın tərcüməsi haqqında məruzə elədi. Məruzədə qeyd olundu ki, əsər 1941-ci ildə yazılsa da, İkinci Dünya Müharibəsinə görə onun nəşri yarımçıq qalmış, daha sonra bir də 1981-ci ildə Ümummilli Lider Heydər Əliyevin təşəbbüsü ilə Nizaminin 840 illiyinin ittifaq miqyasında keçirilməsi ilə əlaqədar olaraq prof. Qəzənfər Əliyev və akad. Ziya Bünyadovun redaktəsi ilə rus dilində nəşr olunub. İndi isə ilk dəfə Azərbaycan dilində türk dünyasına təqdim olunan əsərin tərcüməsi və yeni redaktəsində ötən müddət ərzindəki yeni ədəbi tədqiqatlar da nəzərə alınıb. Məruzədən sonra TÜRKSOY tərəfindən nəşr olunan Kənan Çarboğanın Türkiyə türkcəsinə çevirdiyi "Almas Yıldırımdan Seçme Şiirler" kitabının təqdimatı oldu. ADPU-nun Ədəbiyyat kafedrasının professoru Təyyar Cavadov şairin yaradıcılığı haqqında məruzə elədi, TRT Avaz televiziyasının A.İldırımın yaradıcılığına həsr etdiyi "Kökümüzün izi ilə" sənədli filmi nümayiş olundu. Mədəniyyət Nazirliyinin Beynəlxalq təşkilatlarla əməkdaşlıq sektorunun müdiri Araz Bağırlı öz təəssüratlarını bölüşərək tədbirin yüksək səviyyədə təşkilinə görə təşəkkürünü bildirib, Şuşa şəhərinin türk dünyasının mədəniyyət paytaxtı seçilməsi ilə bağlı TÜRKSOY-la birgə "Türk dünyası mədəniyyət forumu"nun keçiriləcəyi haqqında məlumat verdi, nazirliklə kafedra arasında məhsuldar əməkdaşlıq imkanlarından danışdı, indiyədək nəşr olunan "Nizami və müasirləri" əsərinin çapı və yayımına da nazirliyin yaxından dəstək verdiyini vurğuladı. Sonda çıxış edən Azərbaycanın TÜRKSOY-dakı daimi nümayəndəsi E.Qafarlı bildirib ki, bu gün 5 illiyini qeyd etdiyimiz kafedra Azərbaycanda olmaqla yanaşı, türk dünyasında da fəaliyyətə başlayan ilk TÜRKSOY kafedrasıdır, eyni zamanda ADPU-da Türk araşdırmaları bölməsi də fəaliyyət göstərir. Daimi nümayəndə bildirib ki, ADPU-dan sonra Qırğızıstan, Türkiyə, Qazaxıstan, və Başqırdıstanın ali məktəbləri ilə də müqavilələr imzlanıb, hazırda bu ölkələrdəki daha iki universitetdə kafedra fəaliyyətə başlayıb. Kafedranın tərcümə etdiyi fundamental əsər haqqında da danışan E.Qafarlı xüsusi vurğulayıb ki, Krımski bu tədqiqatı ilə ilk dəfə Nizaminin türk şairi olduğunu dünya elmində isbatlayıb, lakin dünyada, eləcə də Türkiyədə bu gün də Nizami fars şairi kimi tanınır. Ona görə də bu kimi əsərlərin təbliği və yeni tədqiqatların aparılması olduqca vacibdir. Tədbirin sonunda xüsusi xidmətlərinə görə prof. C.Cəfərov, akad. T.Kərimli, prof. A.Zamanov, prof. E.Quliyev, və dos. T.Bədəlova TÜRKSOY-un sertifikatı ilə təltif olunublar.

## ÇEÇEN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN NÜMAYƏNDƏLƏRİ ADPU-DA OLUBLAR

Fevralın 23-də Çeçen Dövlət Pedaqoji Universitetinin (ÇDPU) rektoru İsmail Bautdinoviç Bayxanov, elm və beynəlxalq əlaqələr üzrə prorektoru Tamara Andıyevna Avtayeva və Rus dili və onun tədrisi metodikası kafedrasının müdiri Raisa Amxadovna Buralova Azərbaycan Dövlət Pedaqoji Universitetini (ADPU) ziyarət ediblər. Görüşə, həmçinin Elm və Təhsil Nazirliyinin Beynəlxalq əlaqələr sektorunun müdiri İlqar Dadaşov qatılıb. Görüşdə ADPU - nun rektoru professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, elm və innovsiyalar üzrə prorektoru professor Asəf Zamanov, Filologiya fakültəsinin dekan müavini Könül Həsənova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və mütəxəssis Taisa Mamedova iştirak ediblər.




Görüş zamanı tərəflər çalışdıqları universitetlərin tarixi, strukturu, təhsil proqramları barədə bir-birini məlumatlandırıb. Hər iki universitetdə tədris olunan ortaq ixtisaslar üzrə akademik nəşrlərin və məqalələrin paylaşılması, rus dili kurslarının təşkili və rus dilinin tədrisi və metodikası sahəsində mümkün əməkdaşlıq imkanlarının faydalı olacağı vurğulanıb. Danışıqlar zamanı Çeçenistanda Ümummilli Lider Heydər Əliyev adına küçənin və heykəlin olduğu qeyd edilib, ADPU-nun nümayəndələri yaxın zamanlarda Heydər Əliyev adına Mədəniyyət Mərkəzinin açılışında iştirak etməyə dəvət olunublar.

Sonda qonaqlara hədiyyə təqdim edilib.

# XOCALI SOYQIRIMINDAN 31 İL KEÇİR

## "XOCALI: BİR MİLLƏTİN KƏDƏRİ" ADLI TƏDBİR KEÇİRİLİB



Fevralın 24-də ADPU TGT-nin İbtidai təhsil fakültəsi təşkilatı tərəfindən Xocalı soyqırımının 31-ci ildönümünə həsr olunmuş "Xocalı: bir millətin kədəri" adlı tədbir keçirilib.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb, Xocalı qurbanlarının və vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükut ilə yad edilib. İbtidai təhsil fakültəsinin dekanı professor Qızxanım Qəhrəmanova çıxış edərək Xocalı soyqırımının bəşəriyyətin törədilmiş ən ağır və dəhşətli cinayətlərindən olduğunu, Ermənistan silahlı qüvvələri və xarici hərbi birləşmələrin qəddarlıqla qarşısına çıxan hər kəsi qətlə yetirdiyini vurğulamışdır. Daha sonra ADPU TGT-nin sədri Təhmasib İmaməliyev çıxış edərək faciəyə tarixi aspektdən yanaşmış, Azərbaycana qarşı törədilən bu misli görünməmiş faciənin nəticələrindən danışmışdır.

Tədbir bədii hissə ilə davam etmişdir. ADPU TGT-nin "Buta" instrumental musiqi ansamblının təqdimatında "Bayatı-şiraz" muğamı, Müslüm Maqomayevin "Azərbaycan" mahnısı ifa olunmuş, tələbələrin hazırladıqları müxtəlif şeir və səhnəciklər təqdim edilmişdir.

Tələbələr müxtəlif dillərdə Xocalı soyqırımı ilə bağlı informativ çıxışlar ediblər. Həmçinin, fakültənin foyesində tələbələrin əl işlərindən ibarət sərgi təqdim olunub.

## "XOCALININ SƏSİ"



Fevralın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsi (THİK) Riyaziyyat fakültəsi təşkilatının təşkilatçılığı ilə Xocalı soyqırımının 31-ci ildönümünə həsr olunmuş "Xocalının səsi" adlı anım tədbiri keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbələr iştirak edib. Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, Xocalıda həlak olmuş soydaşlarımızın və vətən uğrunda canlarından keçmiş şəhidlərin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Açılış nitqi ilə çıxış edən universitetin rektoru professor Cəfər Cəfərov deyib: "Xocalı soyqırımı Azərbaycan tarixinə ən dəhşətli və faciəli səhifələrdən biri kimi daxil olmuşdur. 1992-ci il fevralın 25-dən 26-na keçən gecə Xocalıda baş vermiş dəhşətli faciə bəşər tarixində misli görünməmiş bir cinayət aktıdır. Həmin dəhşətli gecədə Xocalı şəhəri tamamilə məhv edilib. Xocalı soyqırımı nəticəsində 63-ü uşaq, 106-sı qadın, 70-i qoca və qarı olmaqla, 613 Xocalı sakini qətlə yetirilib, 8 ailə tamamilə məhv edilib, 25 uşaq hər iki valideynini, 130 uşaq valideynlərindən birini itirib. Düşmən gülləsindən 76-sı uşaq olmaqla, 487 nəfər yaralanıb. 1275 nəfər dinc sakin əsir götürülüb. Əsir götürülənlərdən 150 nəfərinin, o cümlədən 68 qadın və 26 uşağın taleyi bu günədək məlum deyil. Hər il fevral ayının 26-da Azərbaycan xalqı Xocalı soyqırımı qurbanlarının xatirəsini yad edir. Bu gün biz şəhidlərimizin qisasını alıb doğma torpaqlarımızı işğaldan azad etmişik, ona görə də şəhidlərimizin, Xocalı qurbanlarının ruhları şaddır."

Daha sonra Xocalı faciəsi ilə bağlı müxtəlif videoçarxlar təqdim edilib. Anım mərasimində Riyaziyyat fakültəsinin tələbələrinin hazırladıqları Xocalı faciəsinə həsr olunmuş "Bitməyən kədər" və "Zülmətdən işığa" adlı ədəbi-bədii kompozisiyalar təqdim olunub.

## "XOCALIYA ƏDALƏT" KAMPANİYASI ÇƏRÇİVƏSİNDƏ ELEKTRON AKSİYA KEÇİRİLİB



Fevralın 24-də Səbail rayonu Gənclər və İdman İdarəsinin (GİI) təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzində "Xocalıya ədalət" kampaniyası çərçivəsində elektron aksiya həyata keçirilmişdir. Aksiya çərçivəsində ADPU-nun 30-a yaxın tələbəsi tərəfindən dünya ictimaiyyətinə müxtəlif dillərdə Xocalı həqiqətlərini özündə əks etdirən elektron məktublar ünvanlanmışdır.

Aksiyada ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, Bakı şəhər Gənclər və İdman Baş İdarəsinin rəisi Raqif Abbasov və Səbail rayonu Gənclər və İdman İdarəsinin rəisi Elnarə Əliyeva da iştirak etmişdir.

## FAKÜLTƏLƏRDƏ XOCALI SOYQIRIMI ANILIB



Fevralın 26-da bəşər tarixinin ən misilsiz faciələrindən biri olan, mənfur erməni quldurlar tərəfindən Xocalıda törədilən amansız soyqırımından 31 il ötür. Tarix boyu qanlı və şanlı səhifələr yaşayan Azərbaycan xalqı öz qan yaddaşını unutmur, şəhidlərinin xatirəsini daim əziz tutur, eyni zamanda Azərbaycan dövləti tərəfindən xalqımıza qarşı törədilən bəşəri cinayətlərin dünya birliyinə çatdırılması istiqamətində ardıcıl iş aparılır. Qüdrətli Azərbaycan dövləti 2020-ci ilin 44 günlük Vətən müharibəsində işğal altındakı torpaqlarımızı azad elədi, şəhidlərimizin qisasını döyüş meydanında aldı. Bu günlərdə Xocalı soyqırımı qurbanlarının xatirəsi Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) də silsilə tədbirlərlə qeyd olunur. Bu tədbirlər çərçivəsində fevralın 24-də Universitetin fakültələrində ilk dərslər Xocalı faciəsinə həsr olunub. Məktəbəqədər təhsil fakültəsinin tələbələri dərslərə başlamamışdan öncə soyqırımı qurbanlarının xatirəsini bir dəqiqəlik sükutla yad ediblər.

Daha sonra fakültənin foyesində Xocalı soyqırımına həsr olunmuş tələbələrin əl işlərindən ibarət sərgi keçirilib. Fakültə rəhbərliyi, professor-müəllim heyəti və tələbələr sərgiyə baxış keçirib. Fakültənin dekanı dosent Nailə Hüseynova qeyd edib ki, gənclərimizin xalqımızın qan yaddaşına həssas münasibəti, vətənpər ruhlu böyümələri olduqca əhəmiyyətlidir.

Universitetin Fizika fakültəsində də Xocalı soyqırımının 31-ci ildönümü münasibətilə tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, fakültə dekanları, şəhid ailələrinin üzvləri, professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Tədbirdə Xocalı soyqırımı haqqında ətraflı məlumat verilib, çıxış edənlər əsrin faciəsi ilə bağlı təəssüratlarını bölüşərək, Prezident İlham Əliyevin rəhbərliyi ilə ərazi bütövlüyümüzün bərpa olunduğunu, şəhidlərimizin qisasının alındığını vurğulayıblar.
Tələbələrin hazırladıqları kompazisiyalarda faciənin dəhşətləri əks olunub.

## PEDAQOJİ UNİVERSİTETDƏ TƏTBİQ OLUNAN YENİLİKLƏR MÜSBƏT NƏTİCƏSİNİ VERİR



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib. Əvvəlcə Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Giriş sözü ilə çıxış edən rektor professor Cəfər Cəfərov bu misilsiz faciənin heç vaxt unudulmadığını, bütün şəhidlərimizin daim qəlbimizdə yaşadığını vurğulayıb. Rektor çıxışında bildirib ki, artıq Pedaqoji Universitet institusional akkreditasiya ilə bağlı özünüqiymətləndirmə hesabatını hazırlayaraq müvafiq quruma təqdim edib, lakin digər tərəfdən bütün strukturlarda bu sənədin ətraflı təhlili, müzakirələrin təşkili akkreditasiya prosesinə qədər son hazırlıq üçün olduqca faydalı olacaqdır. C.Cəfərov bildirib ki, institusional akkreditasiyadan sonra proqram akkreditasiyası başlanacaq ki, bu sahədə də artıq ADPU-nun təcrübəsi var, ADPU Tvinninq layihəsi çərçivəsində bir neçə fənnin proqram akkreditasiyasını 2019-cu ilə həyata keçirib. Ötən dövrün ümumi icmalına nəzər salan rektor Cəfər Cəfərov beynəlxalq əlaqələrdə xeyli irəliləyişlərin baş verdiyini bildirərək, son bir ay ərzində TÜRKSOY-un baş katibinin ADPU-da olmasını, xarici ali təhsil müəssisələrinin rəhbərləri ilə görüşlərin, Qərbi Azərbaycana qayıdışla bağlı universitetdə ilk ictimai dinləmənin, ADPU-nun kitabxanasındakı nadir kitab və əlyazmaların ictimai təqdimatının keçirilməsini və s. yüksək qiymətləndirdi. Eyni zamanda qardaş Türkiyə Respublikasında baş vermiş dəhşətli zəlzələnin fəsadlarının aradan qaldırılması üçün humanitar yardım aksiyalarında ADPU ailəsinin də fəal iştirakının təqdirəlayiq olduğu qeyd olundu. Daha sonra rektor ADPU-nun müəllimlərindən fəlsəfə doktorluğu elmi dərəcəsi alan Gülnarə Məmmədzadə, Sevda Xəlilova və Könül Həsənovaya diplomlarını təqdim etdi. Sonra tədris işləri üzrə prorektor dosent Eldar Aslanov ADPU-da payız semestrinin qış imtahan sessiyasının yekunları və qarşıda duran vəzifələr haqqında məruzə ilə çıxış etdi. Məruzədə qeyd olundu ki, cari ilin 05 yanvar - 03 fevral tarixləri aralığında keçirilən imtahan sessiyasında mütəşəkkilliyin, şəffaflığın və operativliyin təmini üçün İmtahan Qərargahı və Apelyasiya Komissiyası fəaliyyət göstərmiş, eyni zamanda 20 nəfərdən ibarət İctimai Şura və 20 nəfərdən ibarət Tələbə Monitorinq Qrupu prosesə nəzarət etmişdir. 9.884 nəfər bakalavriat və 621 nəfər magistrant olmaqla ümumilikdə 10.505 nəfər üçün ADPU-nun Sahil və Gənclik tədris binalarında, o cümlədən ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində imtahanlar təşkil olunmuşdur. İxtisas və fənn xüsusiyyətləri nəzərə alınmaqla imtahanlar yazılı, şifahi və hibrid formada keçirilib. İmtahan sessiyasının yekunlarına görə müvəffəqiyyət və keyfiyyət göstəriciləri ötən tədris ilinin analoji semestrinə nisbətdə müvafiq olaraq, 78 faizdən 84 faizə və 38 faizdən 46 faizə yüksəlmişdir. Magistratura səviyyəsində bu göstəricilər müvafiq olaraq, 74 və 68 faiz təşkil edib. Filiallar və kollec üzrə də müvəffəqiyyət və keyfiyyət göstəricilərində artım müşahidə olunur. Vurğulanıb ki, sessiya dövründə Apelyasiya Komissiyasına ümumilikdə 3.065 müraciət daxil olmuşdur ki, bunlardan da 46,5 faizi müsbət həll edilmiş, 36,5 faizi qüvvədə saxlanılmış, 16,5 faizi müraciətdən imtina etmişdir. Bildirilib ki, tədrisin keyfiyyətinin artırılması və tələbələrlə aparılan ardıcıl iş nəticəsində bütün parametrlər üzrə göstəricilərdə irəliləmə müşahidə olunur. Əgər ötən tədris ilində İmtahan Qərargahına 294 müraciət daxil olmuşdusa, cari ildə cəmi 86 müraciət daxil olub, onlardan da 49 nəfər izahat işlərindən sonra müraciətdən imtina etmiş, 14 müraciət təsdiqini tapmamışdır, qayda pozuntusuna görə cəmi ötən tədris ilində 438 iş protokollaşdırılmışdısa, cari ildə cəmi 157 nəfərin imtahan işi protokollaşdırılmışdır, barələrində inzibati-tənbeh tədbirləri görülmüş tələbələrin sayı isə 25-dən 16-a düşmüşdür. Məruzədən sonra Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli sessiya dövründə tələbələrlə keçirilən onlayn sorğunun nəticələrini təqdim etmişdir. Bildirilib ki, onlayn sorğuda ADPU, filiallar və kollec də daxil olmaqla ümumilikdə 2590 tələbə iştirak edib ki, onların əksəriyyəti imtahan və tədris prosesinin təşkilini yaxşı qiymətləndirir. Bununla belə, tələbələr tərəfindən bildirilən bəzi problem və təkliflər də ümumiləşdirilərək Universitet rəhbərliyinə təqdim olunur. Məruzələrin yekununa əsasən, tətbiq olunan yeni imtahan qaydalarının effektiv nəticələri qeyd olunub, qarşıda duran vəzifələr diqqətə çatdırılıb. Həmçinin iclasda ADPU-da Heydər Əliyev ili çərçivəsində görüləcək işlər, Universitetin Himayəçilər Şurasının yaradılması, "ADPU 2030" Strateji İnkişaf Planının hazırlanması, beynəlxalq əlaqələrin inkişafı, yeni ikili diplom proqramlarının həyata keçirilməsi kimi məsələlər də müzakirə olunub. Daha sonra ADPU-nun Elmi Şurasının yeni tərkibi haqqında təqdimat qəbul olunub, cari semestrin nəticələrinə əsasən adlı təqaüdə layiq görülən 12 nəfər tələbənin siyahısı təsdiq olunub. İclas cari məsələlərin müzakirəsi ilə davam etdirilib.

Tiraj - 500
Şəhadətnamə - № 191

GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

# NADİR KİTAB VƏ ƏLYAZMALARA İKİNCİ HƏYAT




















*Məlum olduğu kimi fevralın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Kitabxana-İnformasiya Mərkəzinin təşkilatçılığı ilə universitetin kitabxana fondunda qorunan nadir kitabların sərgisi keçirildi. Tədbirdə ADPU-nun rəhbərliyi və professor-müəllim heyəti ilə yanaşı AMEA-nın müvafiq institutlarının rəhbər şəxsləri və əməkdaşları, millət vəkilləri, müxtəlif universitetlərin alimləri, Azərbaycan Milli Kitabxanasının və AMEA Elmi Kitabxanasının nümayəndələri və digər ziyalılar iştirak edirdilər.*

*ADPU-nun rektoru professor Cəfər Cəfərov tədbirdəki giriş nitqində qeyd elədi ki, Pedaqoji Universitetin kitabxanası ölkəmizin ən zəngin ikinci universitet kitabxanası olmaqla, eyni zamanda xeyli sayda qədim və nadir kitabların, əlyazmaların da qorunduğu unikal bir məkandır. Rektor vurğuladı ki, kitabxananın nadir kitablar fondunda müxtəlif dövrlərə aid 1000 nüsxəyə yaxın nadir kitab və əlyazmalar qorunur ki, onların da 121 nüsxəsi “Azərbaycan Kitab Abidələri” elektron reyestrində qeydiyyata alınıb, digər kitabların da işlənilməsi məqsədi ilə ADPU-nun peşəkar kitabxanaçıları sahə üzrə mütəxəssislərin cəlb edilməsi ilə intensiv iş aparırlar. Nadir kitablar haqqında ətraflı məlumat verən sosial və humanitar məsələlər üzrə prorektor prof. Fikrət Rzayev diqqətə çatdırdı ki, universitetdə yenidənqurma və təkmilləşdirmə işləri ilə bağlı kitabların saxlanılması və qeydiyyatı sahəsində də təkmilləşdirmələr aparılır. O vurğuladı ki, hazırda ADPU kitabxanasının fondunda ərəb, fars, rus, əski əlifbalı Azərbaycan dili və bir neçə Avropa dillərində nəşr olunmuş müxtəlif sahələrə aid nadir nəşrlər qorunur. Prorektor dedi ki, onlar arasında ən qədim nəşr 1741-ci ildə Sankt-Peterburqda nəşr olunmuş Rikotanın o dövr Osmanlı imperiyasından bəhs edən 278 səhifəlik kitabıdır. Millət vəkilləri Anar İsgəndərov və Etibar Əliyev belə bir irsin mühafizə olunmasının önəminə diqqət çərəkərək, bu əsərlərin hər birinin üzərində mütəxəssislərin işləyərək onların reyestrə salınması, transliterasiyası və s. məsələlərin vacibliyini qeyd elədilər.*

Qeyd edək ki, belə bir sərgi Azərbaycan universitetləri arasında ilk dəfə Pedaqoji Universitetdə təşkil olunub. Mövzunun aktuallığını nəzərə alaraq, ictimaiyyətə daha geniş məlumat vermək məqsədi ilə bu nadir kitabların qorunduğu ADPU-nun kitabxanasına baş çəkdik. Kitabxananın müdiri Zinharə Həsənova bizi gülərüzlə qarşıladı. Söhbətin başlanğıcından hiss olunurdu ki, deməyə sözləri, göstərməyə xəzinələri çoxdur: “Universitetet yarandığı günlərdən kitabxana da təşkil edilmişdir. Yarandığı ilk illərdə öz fondunu müəllimlərin mühazirə mətnləri ilə formalaşdıran kitabxanamız hazırda 746.221-dən çox kitab fonduna malikdir. Mərkəzin fondu Azərbaycan, rus, ingilis, alman, fransız, ərəb, fars, türk və slavyan dillərində olan ədəbiyyatlarla zəngindir.” Zinharə xanım deyir ki, Mərkəz fondunun zənginliyinə, oxucu sayına, nadir və qiymətli kitabların sayına görə Respublika ali məktəb kitabxanaları arasında ilk sıralarda yer alır: “Mərkəzin kitab fondu 670.640 nüsxədir. Bunların içərisində 120.622 nüsxə elmi ədəbiyyat, 298.701 nüsxə dərslik və dərs vəsaitləri, 178.577 nüsxə bədii, 72740 nüsxə ictimai-siyasi, 14.171 nüsxə xarici ədəbiyyat, 1.210 nüsxə elmlər doktorluğu və fəlsəfə doktorluğu dissertasiyaları, 4.799 nüsxə magistr dissertasiyası, 17.695 nüsxə avtoreferat, həmçinin 3.304 dövri-elmi nəşrlər və xaricdən alınmış jurnallar yer alır.”

Nadir kitablarla bağlı sualımıza cavab olaraq, Zinharə xanım bildirdi ki, Mərkəzin kitab fondunda 1000 nüsxəyə yaxın nadir və qiymətli kitablar mühafizə olunur. Bunlardan rus dilində 74 nüsxə, fars dilində 29 nüsxə, ərəb dilində 9 nüsxə, əski əlifba ilə 9 nüsxə kitab olmaqla, cəmi 121 nüsxə nadir kitab “Azərbaycanın Kitab abidələri” elektron nəşrində qeydə alınıb və Azərbaycan Respublikasının Milli-mədəni Sərvətləri Reyestrinə daxil edilib. Z.Həsənova, reyestrə daxil olan kitabların universitetin ümumi nadir və qiymətli kitablar fondunun cəmi 12 faizini təşkil etdiyini nəzərə alanda, digər kitabların da reyetrə daxil edilməsi üçün mütəxəssislərin cəlbinin, tədqiqatların aparılmasının vacib olduğunu, bunun hər şeydən əvvəl yeni qiymətli materialların aşkarlanması üçün zəruri olduğunu xüsusilə qeyd edir və tədqiqatçıları, müvafiq qurumları əməkdaşlığa dəvət edir. Müsahibimiz qeyd edir ki, bu kitabların qorunması, saxlanması və elmi-tədqiqata cəlb olunmaları, dissertasiya mövzuları kimi işlənilmələri çox vacib bir məsələdir. Uzun illər ərzində yalnız ümumi fondun tərkibində saxlanılan bu qiymətli mənbələrin ictimailəşdirilməsi və onların xüsusi qaydada ayrıca fond kimi mühafizəsinin təşkili yalnız son illərdə rektor professor Cəfər Cəfərovun diqqəti sayəsində, o cümlədən aparılan təmir və yenidənqurma işləri nəticəsində kitabxananın sahəsinin genişləndirilməsi, maddi-texniki bazasının gücləndirilməsi hesabına mümkün olmuşdur.

Zinharə xanımla söhbətimizin davamını kitabxananın peşəkar əməkdaşlarından Gülnar Yusifova ilə davam etdiririk. 25 illik kitabxanaçılıq təcrübəsi olan Gülnar xanımın Pedaqoji Universitet kitabxanasının nadir və qiymətli kitab və əlyazmalar fondunun işlənilməsində, kataloqlarının və annotasiyalarının yenilənməsində, onların ictimaiyyətə təqdim olunmasında böyük əməyi var. Gülnar xanım əvvəlcə, oxu zalında oxuculara xidmət göstərməklə fəaliyyətə başlayıb, daha sonra ərəb, fars, rus, alman dili və əski əlifba bilikləri sayəsində müxtəlif dillərdəki nadir kitabların annotasiyalarının işlənilməsi prosesində yaxından iştirak etməyə başlayıb və fəaliyyətinin əsas hissəsini bu əsərlərin qorunub-saxlanılması, eyni zamanda onlar haqda məlumatların dəqiqləşdirilməsi təşkil edib. Deyir ki, bu qiymətli xəzinə ilə işləmək istər-istəməz insanı özünə cəzb edir. Gülnar xanımla söhbət edə-edə nadir kitabların qorunduğu fonda doğru irəliləyirik. Həyəcanı üzündən oxunur. Fondda bizə bir neçə əsr əvvələ aid olan nadir əsərləri göstərə-göstərə, eyni zamanda izahlar verir, bu mənbələrin adlarını oxuyaraq, bəhs edikləri mövzular haqqında danışır: “Kitabxananın fondunda qorunun ən qədim kitab 1741-ci ildə Sankt-Peterburqda nəşr olunan Rikotanın Osmanlı imperiyasından bəhs edən 278 səhifəlik karton üzlü əsəridir. Əsər 1957-ci ildə ADPU kitabxanasının fonduna daxil olub. Bu vaxtadək adi rejimdə mühafizə olunan əsərin fiziki-kimyəvi və texnoloji vəziyyəti normal qiymətləndirilir. Kitabxanamızda 1780-ci ildə nəşr olunmuş “İmperatriça Yekaterina Aleksandrovnanın fərmanları” saxlanılır. 564 səhifəlik külliyat 1725-ci ilin fərmanları ilə başlayır. Eyni zamanda nadir fondumuzda böyük Nizami Gəncəvinin Xəmsəsindən “İsgəndərnamə” və “Sirlər xəzinəsi” poemalarının fars dilində XIX əsrə aid daşbasma üsulu ilə çap olunmuş nüsxələri də var. Bunlardan “İsgəndərnamə” poemasının nüsxəsi hicri təqvimlə 1284-cü ilə, yəni miladi təqvimlə 1866-cı ilə aiddir, “Sirlər xəzinəsi” poemasının nüsxəsinin nəşr tarixi isə dəqiq məlum deyil. Bu əsərlərin bərpaya ehtiyacları var. Nəşr ili məlum olmayan daşbasma çapı əsərlərindən biri də 973 səhifəlik “Ərəbcə-türkcə lüğət”dir.” Gülnar xanım deyir ki, ümumiyyətlə nadir fondda, əsasən rus və alman dillərində XVIII əsrdən başlayaraq Çar Rusiyasının tarixinə, coğrafiyasına, müxtəlif təbiət elmlərinə aid, o cümlədən lüğətlər, ensklopedik nəşrlər, bədii ədəbiyyatlar, fars və ərəb dillərində isə, əsasən XIX əsrə aid olan klassik şərq ədəbiyyatı nümunələri, Hafizin, Sədinin divanları, “Şahnamə” və s. çoxluq təşkil edir. XX əsrin əvvəllərində xalqımızın milli maarifçilik hərəkatında aparıcı rol oynamış “Molla Nəsrəddin”, “Füyuzat”, “Dəbistan”, “Tuti” kimi jurnal və məcmuələrin orijinal nüsxələri də xüsusilə diqqəti cəlb edir. Bu əsərlər arasında olduqca maraqlı tarixçəsi olan mənbələr də var. Bələdçimiz Gülnar xanım əlində tutduğu dəri üzlü, fars dilində daşbasma üsulu ilə çap olunmuş məşhur “Tarixi Nadir” kitabının hicri-qəməri 1320, miladi təqvimlə 1902-ci ilə aid nüsxəsini göstərərək deyir: “Bu məşhur əsərin kitabxanamızdakı nüsxəsi 270 səhifədən ibarətdir. Bildiyimiz kimi, “Tarixi Nadir” əsəri Nadir şah Əfşarın şəxsi tarixçisi Mirzə Mehdi xan tərəfindən qələmə alınıb və onun bir çox nüsxələri var. Klassik poetik fars dilində qələmə alınan əsərin oxunması və tərcüməsi olduqca çətin bir işdir. Bizdəki nüsxənin müəllifini müəyyən edə bilməmişik. Ancaq, Mirzə Mehdi xan adlı müəllifin kitabxanamızda digər bir əsəri də var. “Təbriz” adlı 45 səhifəlik əsər hicri 1283-cü ilə (red. – 1866-cı il) aiddir. Ola bilsin ki, müəllif “Tarixi Nadir”in müəllifidir. Lakin digər tərəfdən “Təbriz” tarixi deyil, bədii əsərdir.”

G.Yusifova digər bir maraqlı məqam haqqında da söhbət açaraq deyir: “Bir maraqlı məqam da ondan ibarətdir ki, kitabxananın nadir fondunun formalaşmasında bəzi görkəmli alimlərin şəxsi kitabları da xüsusi yer tutur. Belə ki, zaman-zaman bu alimlər öz şəxsi kitabxanalarını universitetə bağışlamışlar. Bunlardan biri də böyük dilçi alim Əbdüləzəl Dəmirçizadədir. Prof. Ə.Dəmirçizadə ötən əsrin 90-cı illərində olduqca böyükhəcmli şəxsi kitabxanasını bütünlükdə Pedaqoji Universitetin kitabxanasına bağışlayıb. Həmin kitablar təyinatı üzrə müxtəlif fondlara paylanıb. Bu gün nadir kitablarımızı incələyərkən üzərində Ə.Dəmirçizadənin kitabxanasına aid olduğunu göstərən şəxsi möhür olan iki əsər də qarşımıza çıxdı. Bunlardan biri 1913-cü ilə aid (hicri 1331-ci il) təcvid, digəri isə 1922-ci ildə Daşkənddə nəşr olunmuş “Bilim uçaqi” jurnalının I nömrəsidir.” Ürəyi dolu olan Gülnar xanım inanır ki, bu əsərlərin peşəkar mütəxəssislərin cəlb olunması ilə tədqiq olunması ilə yeni elmi faktlar aşkarlana bilər. Biz də bu ülvi arzuya qoşularaq onunla sağollaşırıq. ADPU-da rektor Cəfər Cəfərovun rəhbərliyi ilə aparılan yenilənmə işləri, tədqiqat universiteti istiqamətində atılan addımlar və göstərilən qətiyyət ondan xəbər verir ki, tezliklə bu böyük mədəni irsin tətqiq olunaraq geniş elmi ictimaiyyətə təqdim olunması istiqamətində də ciddi işlər görüləcək. Elə bu ilk sərgi də məhz ictimai fikri bu yönə cəlb etmək, fəaliyyətə başlamaq üçün ilk şölədir.

**Taleh MİRZƏYEV,**
*“Azərbaycan müəllimi”, 24 fevral 2023-cü il, № 08 (9016), s. 9*

## BAŞSAĞLIĞI



Qardaş Türkiyə Cümhuriyyətində baş verən dəhşətli zəlzələdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Təhsildə sosial-psixoloji xidmət ixtisası üzrə 2019-cu il məzunu İsmet Özsöğüt də dünyasını dəyişib. Məzunumuzun timsalında bütün həlak olanların ailələrinə və yaxınlarına dərin hüznlə başsağlığı veririk.



Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 610

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.